*Bu kitab "**Əmani.** Əsərləri" (Bakı, Yazıçı, 1983) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni, ön söz və lüğətin müəllifi: **Əlyar Səfərli**

Redaktoru: **Xəlil Yusifov**

**894.3611 - dc 21**
**AZE**
**Məhəmməd Əmani. Əsərləri.** Bakı, "Şərq-Qərb", 2005, 224 səh.

XVI əsrin sonu, XVII əsrin əvvəllərində yaşayıb-yaratmış Məhəmməd Əmani anadilli şerimizin görkəmli nümayəndələrindən biri olmuşdur. O öz yaradıcılığı ilə ədəbiyyatımıza yeni ideyalar, fikirlər gətirmiş, poeziyamızı forma və məzmunca zənginləşdirmişdir. Qəzəl, qoşma, gəraylı, bayatı, rübai və başqa poetik formalarda ölməz sənət nümunələri yaradan şair həm də Azərbaycan ədəbiyyatında mənzum hekayə ustası kimi tanınmışdır.

Oxuculara təqdim edilən bu kitab Əmaninin yeganə divanına əsasən tərtib olunmuşdur.

**ISBN 9952-418-20-2**

Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

## ÖN SÖZ

1536-cı ildə Azərbaycanın qədim və gözəl Bayburt mahalında Məhəmməd adlı bir oğlan dünyaya gəldi. İgid, qoçaq Bayburt soyundan çıxan bu uşaq böyüyüb boya-başa çatdı, öz ağlı və zəkası ilə çox tez bir zamanda parlayaraq dillərə düşdü. Əmani təxəllüsü ilə incə, zərif şeirlər yazaraq doğma xalqının ruhunu, zövqünü oxşadı, ürəklərdə yuva qurdu, Azərbaycan ədəbiyyatı xəzinəsinə yeni-yeni incilər bəxş edərək ana dilimizin şöhrətini artırdı. Qəzəl və rübailərində böyük Füzulinin, qoşma və gəraylılarında isə Xətayinin yolunu tutdu.

Azərbaycan xalqının tarixində Əmani şair-hökmdar kimi öz qılınc və qələmi ilə dərin iz buraxmışdır. O, cavanlıq çağlarından Səfəvi dövlətinin bütövlüyü uğrunda mübarizə aparan Şah Abbasın hərbi yürüşlərində yaxından iştirak edərək ad qazanmış və şeirlərində də onun bu nəcib təşəbbüsünü alqışlamışdır:

*Hər sayəsi Abbas Şahi-dinpərvər,*
*Rumiğə şikəst berdi bafəthü zəfər.*

Əmani bir şerində isə özünü qızılbaş adlandırır:

*Bu səadət, Əmaniya, bizə bəs*
*Cə’fərimәzhəbü qızılbaşuz.*

Gəzməyi, səyahəti çox sevən Əmani Yaxın və Orta Şərqin bir sıra yerlərini gəzib dolaşmış və öz təəssüratını şeirlərində əks etdirmişdir. Təbriz, Bəlx, Mərv, Mamanlı, Lahıcan, Herat, Məkkə, Mədinə, Süleymanlı və s. yerlərin adını öz şeirlərində məhəbbətlə çəkərək onların təbii gözəlliklərindən, ürəkaçan və pərişan mənzərələrindən danışır. Şair bir şerində isti yer olan Mamanlıdan belə bəhs edir:

*Yay ayı Mamanlıda olanlar hər yək,*
*Şatir sifət istidə vurarlar dütək.*
*Bu türfə ki, gecə-gündüz irür nökərək,*
*Sazəndəvü rəqqasələri pəşşəvü kək.*

Başqa bir şerində isə Süleymanlını xatırlayır:

*Bir neçə Süleymanlıda qış əyyami,*
*Vaqe olucaq burələri, əndami*
*Zəxm eylədilər, məhv elədüz arami,*
*Əlqissə ki, ol gecə besəd nakami.*

Əmani uzun illər Yəzd əmiri kimi fəaliyyət göstərsə də, öz həyatından narazı olmuş və bu narazılıq onun yaradıcılığına da hopmuşdur:

*Əfsus ki, əyyami-cavanlıq getdi,*
*Qəm ləşkəri gəldi, şadmanlıq getdi.*

Bir sıra orta əsrlər şairi kimi Əmaninin də olum və ölüm tarixi dəqiq məlum deyildir. Ancaq Səfəvi hökmdarlarından bir neçəsinin adını çəkməsi göstərir ki, şair yüz ilə yaxın ömür sürmüşdür.

Əmaninin çağdaşı Sadiq bəy Əfşar (Sadiqi) "Məcməül-xəvas" təzkirəsində onu xoştəb və xoşxasiyyət bir şair adlandırmış və şeirlərindən nümunələr gətirmişdir.

Əmanidən ilk dəfə danışan və əsərlərini təhlil edən akademik Həmid Araslı onu orta əsrlər realist şerinin istedadlı nümayəndəsi kimi qiymətləndirərək şairin həyat və yaradıcılığından geniş bəhs etmişdir. Ədəbiyyatşünas B.Azəroğlu isə Əmani haqqında elmi-tədqiqat əsəri yazıb nəşr etdirmişdir.

Əmaninin, yeganə nüsxəsi Londonun Britaniya muzeyində saxlanılan şeirlər divan haqqında ilk dəfə XIX əsrdə ingilis alimi Ç.Riyo söz açmış, Əmani və onun şeirləri barəsində müəyyən fikirlər irəli sürmüşdür.

Şairin divanı qəzəl, qəsidə, qitə, məsnəvi, müstəzad, təkbeyt, mənzum hekayə, qoşma, gəraylı və bayatılardan ibarətdir. Bu şeirlər ideya-bədii dəyəri və sənətkarlıq xüsusiyyətlərinə görə o dövr Azərbaycan poeziyasının ən gözəl, yetkin nümunələri sayıla bilər. Əmani əlvan poetik boyalarla insanın arzu və istəyini, sevinc və kədərini, bir sözlə, daxili aləmini əks etdirir.

Əmaninin divanında qəzələ üstünlük verilir. Bu qəzəllərdə həyati eşq ilə sufi-panteist eşq bir-birinə qovuşaraq birlik yaradır. Onun müasiri olan hər hansı qəzəl şairi üçün bu xüsusiyyət təbii sayıla bilər. Buna baxmayaraq, həmin şairləri sufi şairi adlandırmaq olmaz. Onların əsərlərini araşdırarkən yaradıcılıq və dünyagörüşlərinin bütöv şəkildə öyrənilməsi məqsədəuyğundur.

Dünyəvi sevginin tərənnüm və təsdiqi Əmani yaradıcılığında daha qabarıq nəzərə çarpır. Əmani şeirlərində həməsri insanın bu günü və gələcəyi ilə bağlı arzularını ifadə etməyə çalışır, onun mənəvi gözəlliyini, duyğu və düşüncəsini vəsf edir. Şair yüksək sənətkarlıqla gözəlin surətini çəkərək onun üzünü parlaq aya, mərmər bədənini gümüşə, ağ dişlərini dürrə, dodaqlarını isə qırmızı innaba bənzədir:

*Yüzün məhtabə bənzər, bənzəməzmi?*
*Tənin simabə bənzər, bənzəməzmi?*

*Gözün qiblənüma olub həmişə,*
*Qaşın mehrabə bənzər, bənzəməzmi?*

*Dəhanın içrə dəndanın, nigara,*
*Düri-nayaba bənzər, bənzəməzmi?*

*Şəfayi-dərdi-hicr üçün könülgə*
*Ləbin innabə bənzər, bənzəməzmi?*

Bu şeri əvvəldən axıra kimi Əmani bədii suallar üzərində qurmuşdur, həm də bu suallar cavab almaq üçün yox, əslində təsdiq üçün işlədilir. "Bənzər, bənzəməzmi" sözlərini yanaşı işlətməklə o, şerin bədii-hissi vəhdətini, emosionallıq və ahəngdarlığını gücləndirir. Ona görə də şairin bu qəzəli dil-üslub aydınlığı və gözəlliyi baxımından çox səciyyəvidir.

Əmaninin lirik qəhrəmanı kama çatmayan, gözündən daima qanlı yaş axıdan və səadət həsrəti ilə yaşayan bir aşiqdir. Onun həyat yolu sonu görünməyən bir ayrılıqdır, zəmanə aşiqə dağ çəkdirir, aşiqin bütün arzu və istəyini gözündə qoyur:

*Əhbab, gözümdən axılan qanlı görün,*
*Hər dəmdə könül eyləgən əfğani görün.*
*Əmr ötdüvü görmədik vüsalın əsərin.*
*Payansız olan möhnəti-hicranı görün.*

Həyatın işıqlı cəhətləri ilə bərabər, kölgəli cəhətləri də Əmani poeziyasında qabarıq gözə çarpır. Bütün orta əsr şairləri kimi onun şerində də dərd, qəm və kədərin tünd boyalarla əksi dövrün özündən irəli gəlirdi. Çünki bu kədər tarixin kədəri idi. Orta əsrlərin bədii idrak və fəlsəfi düşüncəsi, həyata, ümumən dünyaya münasibət forması idi. Öz sələf və xələflərindən Füzuli və Vidadi kimi Əmanidə də lirik duyğular ictimai duyğularla birləşir. Harda eşqdən, insan səadətindən söz düşürsə, aşiq qəmlənir, göz yaşı tökür, xoşbəxtliyi də vəfasız sevgilisi kimi özündən uzaqda sayır, onu əlçatmaz, ünyetməz bir aləmdə axtarır. Buna görə də aşiq gecə-gündüz ayrılıqdan, fələyin, dövranın zülmündən şikayətlənir, etiraz səsini ucaldır. Əmaninin lirik "mən"i insani gözəlliyi, əqli-mənəvi ucalığı ürəkdən sevir, şərə, zülmə və cəhalətə isə nifrət bəsləyir. Şairin bədbin əsərlərində belə gələcəyə inam və ümid hissi duyulur.

Məhəbbət və gözəllik nəğməkarı olan Əmani sadə yaşayışı, gözü-könlü toxluğu insanın ən gözəl məziyyəti sayaraq, xaqan və qeysərlərin dərvişlik və səfa ləzzətini duya bilmədiklərinə acıyırdı:

*Ey könül, incimə dərvişliğin vəz'idin,*
*Bu səfa ləzzətini qeysərü xaqan bilməs.*

Əmani də sevgini birlik, bərabərlik və səadət dünyası hesab edirdi. Onun nəzərində bu "dünyada" şah ilə gədanın, yoxsul ilə varlının fərqi yoxdur, insanlar ali duyğularına və ləyaqətinə görə qiymətləndirilir:

*Əcəb halət degilmi eşq qovğası bu aləmdə*
*Təəşşüq eyləgəc tüğyan, müsavidir gədavü şah.*

Əmaninin xalq şeri formasında yaratdığı bayatı, qoşma və gəraylıları isə orta əsrlər Azərbaycan ədəbiyyatının ən gözəl və kamil nümunələridir. Xətayidən sonra Əmani həm klassik, həm də aşıq şeri üslubunda yazdığı şeirləri ilə ədəbiyyatın hər iki qolundan gələn ənənələri birləşdirmişdir. Bu cəhət onun əsərlərinin dil-üslubunda, bədii düşüncə və məfkurəsində də özünü göstərir. Şairin bəzi ifadə vasitələri, poetik deyimləri aşıq – ozan ədəbiyyatı qaynaqlarından baş alır. Onun lirik qəhrəmanı öz istəyi, arzusu, düşüncəsi, zövqü ilə nağıl və dastan qəhrəmanlarını xatırladır.

Qoşma və gəraylılarında Əmani insanı "səfa sürməyə", "məhəbbət bağını" seyr etməyə, quş kimi ötüb keçən və heç vaxt geri dönməyən günlərin qədrini bilməyə çağırır:

*Eşq oduna yanan sönməz,*
*Gedən günlər geri dönməz,*
*Ömrün quşu uşdu qonmaz,*
*Qənimətdir səfa sürmək.*

Əmani şerində aşiq bir yandan gülüb-sevinir, bir yandan isə ağlayıb-sızıldayır. Aşiqin təbiətində olan bu təzad əslində orta əsrlər dünyasının öz ziddiyyətləri ilə bağlıdır. Şairin qəzəllərində aşiq dərdli, ələmli, qoşmalarında isə şad və xoşbəxtdir.

Azərbaycan ədəbiyyatında mənzum hekayə Əmaninin adı ilə bağlıdır. Onun azərbaycanca divanına beş, farsca divanına isə bir hekayəsi daxil edilmişdir. Bu hekayələr məzmun və formaca şairin öz sələflərinin əsərlərindən seçilir.

Bəllidir ki, XVII əsrə qədər yazılan mənzum hekayələr poemaların tərkib hissəsindən ayrılmayan, onların süjetinə daxil olan bir bədii ünsür rolunu

oynayırdı. Buna nümunə olaraq Nizami Gəncəvinin ölməz poemalarını göstərmək olar. Böyük sənətkar, poemalarında kamil hekayə nümunələri yaratmışdır. Şair "Sirlər xəzinəsi"ni bir silsilə hekayələr əsasında qurmuş və didaktik poema janrının tələblərinə sadiq qalaraq bəşəri problemləri əhatə etmişdir.

Marağalı Əvhədinin "Cami-Cəm"ində də mənzum hekayələr sufi-didaktik ruhda yazılmış əsərə bir canlılıq, poetik əlvanlıq və təravət gətirir. Bu forma şairin duyğu və düşüncələrini, bədii-fəlsəfi qənaətlərini aydınlaşdırmağa kömək edir. Əmani isə mənzum hekayəni poemanın tərkibindən ayırıb müstəqil bir ədəbi növə çevirmiş və Azərbaycan ədəbiyyatı tarixində, demək olar ki, ilk dəfə olaraq şeirlər divanında mənzum hekayələrə də ayrıca yer vermişdir.

Əmaninin mənzum hekayələri satirik-yumoristik məzmunu və obraz müxtəlifliyinə görə diqqəti cəlb edir. Həyat həqiqətlərini, real surətləri qələmə alan şair fərdi boyalara və cizgilərə də xüsusi əhəmiyyət verir, psixoloji səciyyəsi ilə yadda qalan personajlar yaradır. "Dəvəsi ölmüş qarı"da qarı fərdi əxlaqi-mənəvi sifətinə görə real bir obraz sayıla bilər. Dəvəsini beş oğlundan çox istəyən, öz boşboğazlığı və deyingənliyi ilə seçilən bu qarı tipik xarakterə malikdir. Hekayəni psixoloji planda quran Əmani qarının çox danışmasını, dəvəsini unuda bilməməsini və dəvə söz-söhbətini yerli-yersiz təkrar etməklə təskinlik tapmasını onun psixoloji xüsusiyyəti kimi göstərir. Şairə görə qarının bu zəhlətökən vərdişi məhz onun öz xarakterindən irəli gəlir.

Hekayədəki hadisə bir qarının öz dəvəsini oğlanlarından çox istəməsi kimi gülməli əhvalatla başlayır. Dəvənin suda batıb ölməsi ilə hadisələr daha da gərginləşir və qarının ölməsi ilə də əhvalat tamamlanır. Əmani məhdud düşünən, dünyanı bir dəvənin varlığında görən bədbəxt qarıya qəlbən acıyır.

Həyat həqiqətinə sadiq qalan Əmani öz hekayələrini inandırıcı, təbii və sadə əhvalatlar üzərində qurur. Onun hekayə qəhrəmanları keçilməz yollardan keçmir, ideal səviyyəsinə yüksəlməyə meyl göstərmir, əksinə, həyati simaları ilə diqqəti cəlb edir. Əmaninin "Tiryəki" hekayəsi də bu baxımdan çox maraqlıdır. Hekayə tiryək xəstəsinin öz-özü ilə daimi mükaliməsi üzərində qurulub. Şair bu mükalimədə tiryək aludəsinin xarakterini işıqlandırır; tiryək çəkməkdən sağlamlığını və xalq arasında hörmətini itirmiş bu insan nəhayət, ağlını başına toplayaraq, iradəsi hesabına bu bəladan yaxa qurtara bilir, necə deyərlər, özü-özünə çıxış yolu tapır.

"Tiryəki" hekayəsinin məzmunu Nizaminin "Sirlər xəzinəsi"ndəki "Tövbə sındıran zahidin dastanı" hekayəsini yada salır. Nizamidə ağır mənəvi-psixoloji böhran keçirən zahidə bir cavan doğru yol göstərməklə onu xilas edir, Əmanidə isə ağıl və iradə ilə hərəkət etmək əsas nicat yolu kimi göstərilir.

Əmani divanında verilən hekayələrdən biri də "Hatəmi-Tai"dir. Bu hekayə romantik ruhda yazılmışdır. Şair əsərdə mənəvi bütövlüyü, əliaçıqlığı,

dözümlülüyü təbliğ edir və bunun əksinə olaraq doğru danışmamağı, inamsızlığı pisləyir.

Hatəmi-Tai lap qədimdən üzü bəri şifahi və yazılı ədəbiyyatda rəmzi surətlərdən birinə çevrilmişdir. Xalq inamına görə onun özü ölsə də, ruhu, əməlləri yaşayır. Hekayə bir karvanın ucsuz-bucaqsız çöldə ağır günə düşməsi əhvalatı ilə başlayır. Yeməyi, suyu qurtaran karvan Hatəmi-Tainin qəbri üstünə gəlib orada gecələyir. Qəfildən dəvənin biri ölür, onun başını kəsib ətini kabab çəkirlər. Ancaq bir nəfər Hatəmi-Taiyə yaraşmayan sözlər deyir. Səhərisi gözlənilmədən bir çapar gəlib yuxuda Hatəmi-Taini gördüyünü və onun məsləhəti ilə bir dəvə gətirdiyini bildirir. Hekayə elə bu epizodla sona çatır.

Əmaninin hekayələri mövzuca rəngarəngdir. O, hekayələrində insanın xoşagəlməz cəhətlərini pisləyərək, onda gözəl, nəcib sifətlər görmək istəyir.

"Yoxsul kişinin hekayəsi"ndə yoxsul bir ailənin ağır güzəranı oxucunu düşündürür. Ailənin yeməyə gündəlik çörəyi yoxdur, aclıq onların gününü qara etmişdir. Ailənin başçısı ata, hökmdara üz tutmaqla bu fəlakətdən qurtulur. Lakin varlanandan sonra yoxsul kişi "cızığından" çıxmayaraq özünü təmkinli aparır.

Hekayədə yoxsul bir adamın gözlənilmədən varlanması nağıl və dastanlarda buna uyğun əhvalatları yada salır. İnsanın birdən-birə varlanaraq yoxsulluğa son qoyması ideyası əslində xalq istəyi və arzusunun bədii ifadəsidir.

Öz gözəlliyi, zərifliyi, ümumi poetik dəyəri etibar ilə Əmani şeirləri klassik poeziyamızın solmaz və həmişəyaşar nümunələrindəndir. O, öz duyğu və düşüncələrinin yüksək poetik səviyyədə ifadəsinə, bədii təsvir vasitələrindən yerli-yerində, məharətlə istifadəyə çalışmışdır. Şairə görə gözəl sənət əsəri sərv ağacına bənzəyir – onun tərifə ehtiyacı yoxdur:

*Şe'rin, şair, demək hər kimə mərğub iməs,*
*Bənzər ona kim, ola cinsi xəridarsız.*

"Ləfz" rədifli qəzəlində o, söz sənətinə yüksək münasibətini bildirərək şerin qarşısında yeni tələblər qoyur qoyur; Sözü inciyə, həm də saf inciyə bənzədir. Əmaniyə görə söz möcüzələr yaradır, onun qüdrətilə gözəllik bağı zinət tapır, incə, zərif qönçələr məhz sözün sehrilə gözlərini açıb dilə gəlir:

*Baği-hüsnüncə ki, baxmaq heç gözün həddi iməs,*
*Qönçeyi-xəndani-guyası gətirmiş bir ləfz.*

Əmaniyə görə sözü ucuz tutmaq sənətkarın özünü ucuzlaşdırır. Ürək meyvəsi olan şeir ali duyğu və amalları ifadə etməlidir:

*Sərf qılmaq ləfzi hər latayilə cayiz deyil,*
*Cism ara çün xeyli-ə'zayə irür sərdar ləfz.*

On altıncı əsrdən başlayaraq Azərbaycan-özbək ədəbi əlaqələri daha da genişlənir, Nəvai və Füzuli hər iki qardaş xalqın ədəbiyyatına dərin təsir göstərməyə başlayır. Azərbaycanda Sadıq bəy Əfşar və Əmani, Nəvai sənətindən öyrənərək onun bəzi əsərlərinə nəzirələr yazırlar. Hər iki Azərbaycan şairinin şeirləri həm məzmun, mündəricə, həm də dil-üslub baxımından Nəvai şeri ilə yaxından səsləşir. Əmaninin əsərlərində çoxlu özbək-cığatay söz və ifadələrinin işlənməsi məhz bununla əlaqədardır.

Bütün bunlarla yanaşı, Əmani yaradıcılığında Nəsimi və Füzulinin də təsiri nəzərə çarpır. Bu iki böyük şairin sənətkarlıq sirlərindən öyrənən, humanist ideallarından ilham alan Əmani onlara məxsus bədii-fəlsəfi kəlamları, sağlam və qabaqcıl ənənələri davam etdirir. Onun "Ey xoş ol aşiq ki, qılğay can fəda cananına" misrası ilə başlayan qəzəli Füzuli şeri ilə yaxından səsləşir. Füzulinin lirik qəhrəmanı kimi Əmaninin lirik qəhrəmanı da fədakar, dəyanətli və bəxtsiz bir aşiqdir. Bu aşiq zəmanəsindən nə qədər zülm görsə də, öz qürurunu, şərəfini saxlamağa çalışır.

Əmaninin ictimai məzmunlu şeirlərində də Füzuli şeri ilə səsləşən cəhətlər çoxdur. Bu şeirlərdəki bədii məntiq, ictimai düşüncə və motivlər, dil və ifadə vasitələri Füzuli şerini xatırladır. Əmaniyə görə də, sevən aşiqi dərdə salan, onun mənəvi azadlığını əlindən alan, gününü qara edən dövrandır, tale və qismət isə əslində bir bəhanədir.

*Yar bimehrü fələk kinəvərü bəxt zəbun*
*Ey Əmani, söləgil kim, neləsün xəstə könül?*

"Könül" rədifli bu qəzəlində Əmani mənsub olduğu dövrün, orta əsrlər dünyasının ziddiyyətlərini açıb göstərir; insana mənəvi əzab-əziyyət verən, onun səadətini əlindən alan zəmanəyə öz etirazını bildirir.

Əmani yaradıcılığında nikbin ruhlu şeirlər də xüsusi yer tutur. Bu şeirlərdə şairin irəli sürdüyü həyat fəlsəfəsi, nikbin duyğu və düşüncələr insana ümid verir, onu qanadlandırır. Qəzəllərindən fərqli olaraq Əmaninin qoşma və gəraylılarının dili, üslubu son dərəcə aydın, rəvan və təravətlidir:

*Şad ol, könüla ki, yar gəldi,*
*Qəm getdivü qəmküsar gəldi.*
*Məhv oldu fəraqü vəsl yetdi,*
*Gül bitdivü sədhəzar gəldi.*

Əmani, bir bəndini nümunə gətirdiyimiz bu şerində öz müasirlərini şad olmağa, həyatdan, güldən, çiçəkdən, gözəlin vüsalından kam almağa, sevinməyə çağırır və insan ömrünün mənasını, dəyərini də belə bir həyat nəşəsi ilə ölçür.

Hikmətli sözləri, mənalı ifadə və məsəlləri ustalıqla seçib işlətmək, Əmani şerinin bədii təsir gücünü daha da artırır:

*Qəmzəsi könlüm quşun seyd eyləgəc,*
*“Olsun av qanlu” – dedi lə’li-ləbi.*

Bu beytdə məşuqə öz naz-qəmzə oxu ilə aşiqin “könül quşunu” ovlayan bir ovçudur. Şair ov, ox sözlərini qəsdən işlətmir, yalnız nəzərdə tutur. O, gözəlin “ləl” kimi qırmızı dodaqları ilə aşiqin ürəyi və qanlı ov arasında bir bənzəyiş, bir uyarlıq axtarıb tapır.

Əmani ayrı-ayrı söz və ifadələri təkrir kimi işlətməklə şeir dilinin canlı, gözəl və ahəngdar olmasına çalışır:

*Bu nə mətləb, dilsitandur bu,*
*Bu nə aşub, əqlü candur bu.*
*Bu nə müjgan ki, tiri-pərrandür,*
*Bu nə əbru ki, çün kəmandur bu.*

İki beytini nümunə göstərdiyimiz bu qəzəlin bütün misralarında “Bu nə” sətirbaşı sözləri ön təkrir kimi işlədilmişdir.

Bəzi şeirlərində isə Əmani təkrirdən misranın axırında istifadə edir. Sözlərin birini təsdiq, digərini inkar mənasında işlədərək, şair güclü son təkrir yaradır ki, bu da şerin forma gözəlliyini artırır:

*Yüzün məhtabə bənzər, bənzəməzmi!*
*Tənin simabə bənzər, bənzəməzmi?!*

Bu beytdə şair, gözəlin üzünü aya, bədənini gümüşə bənzədərək “bənzər, bənzəməzmi” sözləri ilə öz bədii məramını canlı, təbii şəkildə ifadə etməyə çalışır.

Əmani şerə musiqi ahəngi, səs gözəlliyi aşılamaq üçün cinaslı sözlərdən də məharətlə istifadə edir. Şair bir qəzəlində “bir yanə” söz birləşməsini cinas kimi belə mənalandırır:

*Döndü büryanə yanub, dönmədi bir yanə murad,*
*Atəşi-hicriğə, ya rəb, necə bir yana könül.*

Bəzən də Əmani səslərin düzülüşü və təkrarı vasitəsilə şerə şirin bir musiqi ahəngi verir:

*Qonağü qonşu qarının sözidin,*
*Usanıb, nifrət etdilər yüzidin.*

Şairin, “Dəvəsi ölmüş qarı” hekayəsindən misal gətirilən bu beytdə “q” səsinin təkrarı yuxarıdakı fikrimizə sübutdur.

Əmani ərəb və fars sözləri yerinə doğma, ana dilindən alınmış sözlər işlətməklə sadə, aydın və təbii bir dildə yazıb yaratmışdır:

*Vadiyi-heyrətdə qaluxlardanuz,*
*Atəşi-həsrətdə yanuxlardanuz.*

– beyti ilə başlayan qəzəldə “yolux”, “yavux”, “sovux”, “yazux”, “sınux” həmqafiyə sözlər kimi işlədilir.

Beləliklə, bu nəticəyə gəlirik ki, Əmani öz yaradıcılığı ilə Azərbaycan ədəbiyyatına yeni ideyalar, fikirlər gətirmiş, şerimizi forma və məzmunca zənginləşdirmişdir. Onun şeirlərində dünyəvilik, xəlqilik və realist keyfiyyətlər qabarıq şəkildə özünü göstərir, yazılı və şifahi ədəbiyyat ənənələri ayrılmaz vəhdət təşkil edir. Bu baxımdan Vaqif və Vidadi kimi şairlər Əmani şerindən bir örnək kimi faydalanaraq onun gözəl, qabaqcıl ənənələrini davam və inkişaf etdirmişlər.

İnanırıq ki, öz bədii gözəllik və təravətini saxlayan Əmani şeirləri müasir oxucularımızın da marağına səbəb olacaq.

***Əlyar Səfərli***

# Qəzəllər

* * *

Ərz elə gər tüşsə məcal, ey səba,
Halımı canınıma bəhri-xuda.

Söylə, anın kibi giriftari-hicr,
Bar əcəbüm kim, ola bu dəhr ara.

Hiç kəm olmaz, kərəmin bəhridin
Tapsa nəva qətrəcə binəva.

Bəd iməs ər padişahın lütfidin
Qürb məqamiğə yetişgəy gəda.

Mehri-rüxindin görünən zərrələr
Bardurur ayineyi-gitinüma.

Kuyi ğubarı ülüləbsar üçün
Boldu əzəl qismətidə tutiya.

Hər necə yar etsə Əmaniğə cövr,
Caniğə bar minnəti-bimüntəha.

* * *

Eşqü aşiq, Turü Musa, dəsti-əsli-müddəa,
Ləntərani nəhy izhar eyləmiş ol məhliqa.

Lütf bil, ey eyn, əgər görsətmədi vəchin sana,
Nazü istiğnası birlə lütfə köprək mübtəla.

Xidmətə təfsirimiz hərçənd kim, bardur, şəha,
Bak iməs, andin füzun irür çü ümmidi-rica.

Ey xoş ol aşiq ki, canan eşqidin təhtəs-səma
Etməmiş idrak ömr əyyamidə sübhü məsa.

İqtida ustadi-eşqə eyləyən sahib-səfa,
Lütfü qəhri bir bilib cananidin gözlər riza.

Ey müğənni, saxlagil sazını kim, bu bəzm ara
Eşq ahəngi verir sövtiğə üşşaqın nəva.

Eşq irür ruzi-əzəldin çünki ənvarül-hüda,
Ey Əmani, səy qıl sərf ola övqatın ona.

* * *

Bu sifət tüşgüncə bəzmi-vəsli-canandin cüda,
Kaş ki bolğay idim yekbarəgi candin cüda.

Dideyi-ğəmdidə hər dəm əşki-xunalud ilə
Dürfişanlığlar edər ol lə’li-xəndandin cüda.

Olmuşam aşüftəvü zarü pərişanruzigar
Ol xəti-reyhanü cə’di-ənbərəfşandin cüda.

Bolmasa bir dəm qərarım yarsız, irməs əcəb,
Zərrə biaram olur xurşidi-tabandin cüda.

Tan iməs gər hicr bidadidin əfğan etməsəm,
Bülbül olur binəva tüşgəc gülüstandin cüda.

Rahətü arami-canü könlüm irdi ol pəri,
Ah kim, qıldı sipəhri-dun məni andin cüda.

Ey Əmani, cövr çəkkən barmola heç mən kibi
Dərdi-hicrandin cüda, ənduhi-dövrandin cüda?

* * *

İki aləmdə könülğə müddəa
Cüz rizayi-dust irməs, mücməla.

Sə’y qıl kim, bolmağiysin bir nəfəs
Yadidin xali xəlavü həm məla.

Ol ki, bar qəyyumi-həyyi-layəmut,
Zatiğə yox ibtidavü intəha.

Qüdrətinin bəhridin bir qətrədür,
Əhli-biniş eyniğə ərzü səma.

Hasil olur cü'din tənviri-qəlb,
Əklə mayil bolma köp, irür həba.

Taəti məqbul olur bişəkkü reyb,
Hər kimə eşq olsa sahibiqtida.

Bixirədlikdür, Əmani, bil yəqin,
Dəhr əhlindin təmə' qılmaq vəfa.

* * *

Dəhr ara yox çəkməmiş bir kimsə dövrandin bəla,
Leyk mən dik heç kişiğə yetməmiş andin bəla.

Sə'b iməsdi dövri-cövri zarü heyran könlümə,
Yetməsəydi nagəhan gər xeyli-hicrandin bəla.

Çöhreyi-zərd üzrə əktim mehr töxmin ta görəy
Hasilin, yetdi ona bu seyli-müjgandin bəla.

Ahü əfğan tərkin etmək mümkün irməs eşq ara,
Başə gər yüz qatla gəlsə ahü əfğandin bəla.

Ey Əmani, dust yadi birlə sərf et ömrünü,
İstəsən kim, yetməgəy imanğə şeytandin bəla.

* * *

Ya rəb, cahanda mən kibi bir zar barmola?
Könlü figarü didəsi xunbar barmola?

Nakam hər aradə mənim kimi namurad
Hiç kim, bekami-xatiri-əğyar barmola?

Dareyn ara könüldə bolan intizar dik
Bir dərdi-binəhayəti-düşvar barmola?

Ğəm heç kim ilən etmədi tərki-rəfiqliğ,
Anın kimi ənisi-vəfadar barmola?

İqlimi-eşq içində, Əmani, könül sifət
Bisəbrü biqərarü giriftar barmola?

* * *

Vüsalın dövlətidin gərçi durəm, ey mələksima
Və lakin bar ümidüm nitqin olğay quti-ruhəfza.

Vücudin görməsəm mövcud nabud olmağum, billah,
İməstür bir nəfəsdin biş, bişəkk, ey güli-rə'na.

İrür, ey sərvinazım, az gər hər dəm dönəm yüz yol
Başınğa, çün qədin bardur xuramanlıqda bihəmta.

Mə'lul olmam təəllüqlərdin, ər bolmasa heç nəstəm,
Ğəmi-eşqin mənə bəsdür çü əzdünyavü mafiha.

Cəfa tiği bilə gər qit'ə-qit'ə eyləsən cismim,
Sənin mehrinğə bir zərrə zəvalı yetməyə qət'a.

Könlünün arizusu şərhidin aciz irür til kim,
Ona hüsn ani dik yetməs sifət güncayişi əsla.

Demişsin kim, Əmani, qılğa bermən aman bir dəm,
Zəhi-fərxəndə ol saət ki, tapqay bu xəbər inşa.

* * *

Yox əcəb gər bolmuşam şeyda sana,
Bermiş izəd dilrüba sima sana.

Türfə cövhərsən, əya mir'ati-hüsn,
Ahim etməz hiç əsər qət'a sana.

Çün ədimül-mislsin, bardur müdam
Valehü şeyda təmam əşya sana.

Sövdügün birdür çü ikki dünyadə,
Ey könül, yetməsmü bu sevda sana?

Çün vəfasızdur, Əmani, kəm gərək
Zərrədin dünyavü mafiha sana.

* * *

Hüsn iqlimi müsəxxərdür sana,
Huriyü qılman sənagərdür sana.

Sehri-Samir bolsa irməs kargər,
Sözlərim çün badi-sərsərdür sana.

Nisbət etmək kimsəqə bolmas səni,
Nazəninlər cümlə çakərdür sana.

Bir nəzər qıl, çünki həqq əltafidin
Bəndəpərvərliq müyəssərdür sana.

Yaşınur gərgəc yüzün mehri-münir,
Ya rəb, ey məh, bu nə mənzərdür sana.

Kam bərvəchi-həsən sürgil müdam,
Kövkəbi-bəxtin çü yavərdür sana.

Olmagil qafil, Əmani, halidin,
Ol, kəmini-kəmtərinlərdür sana.

* * *

Ey ki, xətm etmiş nübüvvət rütbəsin sübhan sana,
Minnət irür canə olmaq sidq ilə qurban sana.

Leylətül me'rac vəsfin eyləmək irür məhal,
Payeyi-övla çü olmuş ol zaman Keyvan sana.

Xoş ülüvvi-şə’n irür kim, eyləmiş yəzdani-pak
Ənbiyalərni şəfaət xanidə mehman sana.

Səd həzaran afərin hüsnün çəkən nəqqaşə kim,
Cinnü insü vəhşü teyri eyləmiş heyran sana.

Bu səadət ikki aləmdə yetər sidq əhliğə –
Kim olubdur bəyyinati-hər bəyan Qur’an sana.

Əhli-üsyanın ümidi bimdin irür füzun,
Macəranı çün buraxmış sahibi-divan sana.

Bardur ümmidi Əmaninin ki, niyrandin aman
Tapqay, əlbəttə, götirmüş çün dürüst iman sana.

* * *

Ya rəb, bu lütf kim, elədin xəlq ara mana,
Həddim iməs ki, şükrün edəm şərh, mücməla.

Lütfün bəyanını əbədüd-dəhr, filməsəl,
Can nitqi qılsa, olmaya mindin biri əda.

Bir zərrə tapsa ləm’eyi-mehrini tirə xak,
Ay ilə günğə gecəvü gündüz verür ziya.

Çün satirül-üyubsənü ğafirüz-zünub,
Yox bim, ümid var günəhkarə həşr ara.

Sərmayeyi-həyati-əbəddür məhəbbətin,
Xoş ol ki, bu ətiyyə ona eylədin əta.

Bardur ümmidim ol ki, bu biganəvər könül
Nadidə aşinalarına ola aşina.

Bişəkk Əmani tövf edəcəkdür hərimuni,
Lütfün ona çün olmuş əzəl gündə rəhnüma.

* * *

Aləmdə rahət olsa nəsib ər əna mana,
Ğeyri-rizayi-dust iməs müddəa mana.

Tabi-nəzər gətürmədügiminin vücuhdin,
Göstərmədi inqabsız ol məhliqa mana.

Kuyi-ğubarı oldu qəsəmnakü binəsib,
Eyni-yəqin ziyası üçün tutiya mana.

Namərzi olsa vəz’ iməs baisi-ğəmüm,
Lütfü irür həmişə çü müşgülgüşa mana.

Əbnayi-dəhrə qalmadı sövdayi-ülfətüm,
Biganəvəş olursa, ni tan, aşina mana.

Müstəğniyəm çü eşqidə, dünyavü üqbdin
İnsü mələk gətürsə, ni tan, iltica mana.

Ümmidvar irürmin, Əmani kim, eyləgəy
Hər işdə lütfü mərhəmətin rəhnüma mana.

* * *

Nəzəri-lütf edəli ğəmzeyi-cananə mənə,
Aşinalığ həvəsin eylədi biganə mənə.

Tərki-sər eylərəmü eşqini tərk eyləməzəm,
Naseha, faidəsizdür deməк əfsanə mənə.

Türfə səyyad irür ol, mürgi-könürl seydi üçün.
Zülfü xal ilə qurur dam bilə danə mənə.

Ömr peymanəsi çün kim, dolacaqdur axır,
Saqiya, lütf edə gör bir neçə peymanə mənə.

Mütriba, hacət iməs kim, sana təsdiq berəm,
Ərğənun, sarin irür naleyi-məstanə mənə.

Munca aludəliğ içrə vərəüm bar, bilmən,
Aqibət neyləyə bu məşrəbi-rindanə mənə.

Çün Əmani sifətəm sakini-səhrayi cünun,
Əql şəhrində, ni tan, bolmasa kaşanə mənə.

* * *

Həq bilür kim, səndin özgə yoxdur canan mana,
Olsa bu sözdə xilafım, olmasun iman mana.

Müttəle' ol aləm ətvariğə irməsmin, vəli,
Bu cəhan bağı irür səndin cüda zindan mana.

Ni gecə uyqu, ni gündüz bardür aramım dəmi,
Türfə iş görsətti axır dideyi-giryan mana.

Ey güli-rə'na, sana şeydayəm andaq kim, iməs
Bülbüli-nalan cahan bağında həmdastan mana.

Kargər irməs dilü canımğa istilayi-ğəm,
Eşq ədibi çünki bardur hadiyi-ərkan mana.

Türfə halətdür ki, kinin əksük etməs zərrəcə,
Munca bidadı kim, eylər gərdişi-dövran mana.

Eşq dəryasiğə müstəğrəq bolubmin şövqdin,
Vəslü hicran, rahətü möhnət irür yeksan mana.

Sənsizin, ey dilrüba, hicran ara təskini-ğəm
Bermədi heç növ ilə fəryad ilən əfğan mana.

Ey Əmani, ğüssə rəf'in eyləmək mümkün iməs,
Çün olubdur bəxti-nafərman bəlayi-can mana.

* * *

Bu cahan gülzarı ansız xar bolmuşdur mana,
Rahəti hər qism ilə azar bolmuşdur mana.

Həsrəti-bəzmi-vüsalü şiddəti-hicran ilə
Zindəganlıq, mücməla, düşvar bolmuşdur mana.

Sövdügindin ayru tüşmək valehi-bitabğə,
Sə’b ölümdin bolmağı izhar bolmuşdur mana.

Bəs ki, qalur uyqusuz peyvəstə zənduhi-fəraq,
Hər biri kirpiklərin mismar bolmuşdur mana.

Bavücudi-dərdə-biəndazə xürsəndəm müdam,
Çün xəyalı məhrəmi-əsrar bolmuşdur mana.

Can nizarü cism bimar olmağının baisi
Tilbəliğ qılğan dili-əfgar bolmuşdur mana.

Ey Əmani, gər vərə’ təğyir tapsa, tan iməs,
Afəti-din ol büti-əyyar bolmuşdur mana.

* * *

Bir təbəssüm birlə huşum aldı duş ol nuşləb,
Valehü şeydayi olsam ta əbəd irməs əcəb.

Canü dil qurban ona kim, bir nəzərdə fəhm edər
Müddəanı nüktədanlıq birlə bihüsni-tələb.

Bisəbəb irməs başımla gəlməgim pabus üçün,
Astanınğa ğədəm basmaq irür tərki-ədəb.

Bu səadət ikki aləmdə yetər min zarğə –
Kim, vəfa əhli səgi-kuyin qoyubdurlar ləqəb.

Aşiqi-dilxəstənin baliniğə canan qədəm
Bassa, sidq ilən nisar edər rəvanin bitəəb.

Kim ki, məsti-peyxumari-badeyi-vəhdət olur,
Mütləqa meyli iməs kim, şürb edə ma’i-inəb.

Ey Əmani, bir nəfəs aramım olmassa, ni tan,
Hicr bimarı olan bolmas dəmi bitabü təb.

* * *

Yüzün görgəc iraqdin qopdu könlüm iztirab eyləb,
Tamaşa zövqü birlə öz-özidin ictinab eyləb.

Çü eynim rövşən oldu, arizin şəm’iğə can mürği
Uçub pərvanə yanlığ getdi, tövf üçün şitab eyləb.

Yədi-qüdrət ki, nəqqaşi-əzəldür hər nüfus üçün,
Çəkipdür təl’ətini, nüsxeyi-hüsn intixab eyləb.

Quyaş mehri-rüxindin biqərar olsa bəid irməs –
Kim, ol həm zərrəliq lafin vurar, yüz abü tab eyləb.

Xoş ol şeydayi-valeh, dilrübasiğə qılğay,
Təəşşüq əşkinin hər qətrəsin yüz min hübab eyləb.

Tutun mə’zur əgər bitablığdin tilbəliq qılsam –
Ki, bolmuşmin müqabil bir pəri birlə, xitab eyləb.

Tan irməs hicr ara gər vəsl əyyamin bəyan etsəm,
Mədarin ötürür şeyb əhli vəsfi-şəbab eyləb.

Ona kim, badeyi-vəhdət nəsib olmuş qəsəmna din,
Şərabi-nabə meyl etməs, xirəd mülkün xərab eyləb.

Əmani yastanıbdur astanın çünki müddətlər,
Sayıb kəlbi-dərin istədgil anı, kamyab eyləb.

* * *

Ni əcəb, ol mahi-taban bolsa mətlubül-qülub –
Kim tülu etgəc xəcalətdin quyaş eylər ğürub.

Ey xoş ol fərxündətale kim, müqabil müttəsil
Bardur öz kamincə mətlubiğə çün qütbi-cənub.

Guşə tut, tərk eyləgil, ey pir, igitlər söhbətin,
Bədnümadur tazə güllər yanidə çün xüşk çub.

Vəz'i-namərzivü mərzi bolsa, tan saymas xirəd,
Çün irür məxluqi-xaliq dəhr ara hər ziştü xub.

Öylə kim, zahirdəsin batində həm olgil elə,
Çün bilür hər bəndənin sirrini əllamül-ğüyub.

Etmək olmas bu səadət şükrini heç növ ilə,
Eybi ifşa etmədi aləmdə səttarül-üyub.

Ey Əmani, mə'siyyət hərçənd kim, bihəddü həsr
Oldu, novmid olmazuz həq bir çü ğəffarül-zünub.

* * *

Yetdi can ağzumğa, cana, lə'li-xəndanın görüb,
Qıl təbəssüm, vasil etgəy dürri-ğəltanın görüb.

At peyapey navəki-ğəmzən, hədəf sinəm qılıb,
Cəm olupdur xatirim, zülfi-pərişanın görüb.

Gərçi tən fərsudə bolmuşdu ğəmi-pünhanidin,
Yengidin can tapmışam lütfi-nümayanın görüb.

Çəkmə bağrımdin oxun, cana ki, bə'di-intizar
Həmqərin tapmış yürək öziğə peykanın görüb.

Şadman ol, ey könül, köp zar bolma ğüssədin,
Mültəfit halunğa olur, yar əfğanın görüb.

Saydılar yaqut xəttin nəsx ərbabi-xütut,
Səfheyi-rüxsarın üzrə xətti-reyhanın görüb.

Xingi-dövran bavücudi-sür’əti-həddin bürun
Qaldı heyran ərsədə, cövlani-yekranın görüb.

Əndəlibin naləsin, ey gül, təəccüb qılma kim,
Çak edibdür cameyi-can, çaki-damanın görüb.

Biəsər bolsa Əmani vəsl ara, tan sayma kim,
Zərrə dik bitab olur xurşidi-tabanın görüb.

* * *

Qaldı heyran gözlərüm, bir dilrüba məhru görüb,
Canğa ot düşdü, biyaban təşnəsi dik su görüb.

Natəvan olsam, ni tan kim, getdi əldən ixtiyar,
Bir pərivəş, nazəninheykəl, qəvibazu görüb.

Eyləgəc zahir təbəssüm tişlərin əqlüm çaşar,
Cövhəri yanlığ ki, dil bitab olur lö’lu görüb.

Barmola, ey dustlər, heç mən kibi bu dəhr ara
Bidilü şeyda bolan bir nərgisi-cadu görüb?

Vəsldin məhrum, ya rəb, xarü zarü biqərar,
Necə bir hicr odiğə köygülməyən qayqu görüb.

Sərvnazindin xəcil bağ içrə boldu bağban,
Cu kənarında xuraman qaməti-dilcu görüb.

Ey Əmani, daxili-insan degil ol kimsə kim,
Bolmaya şeydavü heyran surəti-niku görüb.

* * *

Məni dövrani-fələk eylədi bimarü ğərib,
Əcəbüm bar kim, ola dövləti-didar nəsib.

Könlümün dərdini bilmən nə mərəzdür, ya rəb –
Kim, əlacını anın tapmadı heç növ təbib.

Ey rəfiq, eyləmə rüsvalığımı mən ki, bar
Afəti-dinü dil ol ğəmzeyi-pürməkrü fərib.

Eşq divanəliğin tərk edə bilmən hərgiz,
Boldu Məcnunğə cünun haləti çün zinətü zib.

Müşfiqa, sakini-beytül-həzənəm, peyvəstə
Bidilü zarü həzin bolduğumu sanma əcib.

Hiç bab ilə könül, ğəm yemək irməs hacət,
Səhl irür cümlə günəh bolsa əgər lütfi-həbib.

Müğtənib bilgil, Əmani, ğəmi-eşqi təğyir
Tapmadı, hər necə sə'y eylədi bidilğə ədib.

* * *

Dəhri-dun hər dəm edər könlümə bidadni köp,
Neyləyin, eyləməyib ah ilə fəryadni köp?

Cövrünün aciziğə səbr eləməkdür çarə,
Çünki viran eləmiş xatiri-abadni köp.

Bixirədliq irür andin təmə'i-mehrü vəfa,
Hər zaman zahir edər şiveyi-əfsadni köp.

Müddəa əksi irür çün rəvişi peyvəstə,
Əcəb irməs eləsəm vəz'idin iradni köp.

Ədlini ummagil andin, çü edipdür adət
Tişeyi-zülm bilə ğazmağa bünyadni köp.

Bolma məğrur əməl bağına kim, dəhreyi-dəhr
Bix bər çün eyləmiş sərv ilə şümşadni köp.

Ey Əmani, həzər et hiyləsidin bu fələgin,
Eyləmiş bəndeyi-fərmanbəri azadni köp?

* * *

Ey könül, rəyincə əyyam oldu, dut.
Natəmamın barca itmam oldu, dut.

Dəhri-bibünyad ara hər bir qulun
Padşahi-Misr ilən Şam oldu, dut.

Xakrubi-astanın ruzü şəb
Qeysərü-xaqanü Bəhram oldu, dut.

Olubən məqbuli-ərbabi-qülub,
Adın el tilində xüddam oldu, dut.

Nüktədanlıq birlə olub muşikaf,
Hər sözün aləmdə eyham oldu, dut.

Kasə bolğaydur sərin çün aqibət,
Sağərin Cəmşid içən cam oldu, dut.

Ey Əmani, yüz həvəs birlə könül
Yetişib kamiğə, nakam oldu, dut.

* * *

Qaşın mehrabiğə ruzi-əzəldin iqtidamız bar,
Əcəb yox, gər təvəccöh vəchinə bimüntəhamız bar.

Cəmalın əksini görmək dilərsən, ey gözüm nuri,
Könül güzgisidin ayineyi-giytinümamız bar.

Ğəmi-eşqin həmişə müstədamü bərqərar olsun
Kim, andin bu cahan mülkündə xoş zövqü səfamız bar.

Anınçun zarü nalanəm deməssin, ey güli-rə’na,
Bəlalər mübtəlasi bir əsiri-binəvamız bar.

Fəraq əyyamivü dövran ğəmi möhlik mərəz irür,
Əlac etmə, təbiba, çünki dərdi-bidəvamız bar.

Rəqiba, qürbə məğrur olma köp kim, şol səri-kudə,
Sənin dik itləri xeylidə bihədd aşinamız bar.

Hüsuli-məqsəd üçün müddəi keyd etsə, ğəm irməs,
Bəlalər dəf’iğə hər dəm, Əmani, yüz duamız bar.

* * *

Ansız yenə könlümdə ğəmu gözdə nəmüm bar,
Aramım olub məhv, əcəb halü dəmüm bar.

Yox gecəvü gündüzdə dəmi xab ilə tabım,
Bilmən ki, tənü dildə neçə dərdü ğəmüm bar.

Mən zarğə cüz vəsl iməs çarə, təbiba,
Can nəbzidə hicran mərəzidin vərəmüm bar.

Aşiqlər ara səltənəti-eşq mənimdür,
Əfğan ilə ahim bilə kusü ələmüm bar.

Fariq irürəm vahimədin daim, Əmani,
Ehsan iyəsi çünki vəliyyün-niəmüm bar.

* * *

Tan iməs gər yarının əğyarı bar,
Atəşin gülün əzəldin xarı bar.

Vəh kim, oldu ğeyr birlə həmzəban,
Heç deməs bir xaksari-zarı bar.

Necə bolğay hal kim, ol ğönçələb,
Adum izhar eyləməkdin arı bar.

Yüz çevürmən cövridin, ta sanmağay
Eşqidə iqrarının inkarı bar.

Qürbü bö’d irür müsavi, ey könül,
Rəmzi-ixfasidə çün izharı bar.

Ey xoş ol aşiq ki, lütfü qəhridin
Könlünün iqbalü ni idbarı bar.

Bolma naümmid, Əmani, rəhmdin,
Çünki hər təqsirin istiğfarı bar.

* * *

Ol pərivəş kim, qədi-rə'na, rüxi-zibası bar,
Könlüm ilə eşqinin yüz nazü istiğnası bar.

Natəvanü xarü zar olsam, nə ğəm, ol şüxə kim,
Hər tərəfdə səd həzaran mən kibi şeydası bar.

Mən qılmin etməsəm əfğan kim, ol gül eşqinin
Əndəlibi-könlüm ilən büləcəb gövğası bar.

Türfə halətdür, rəfiqə, eşq istilası kim,
Könlümün ni taqəti-izharü ni icfası bar.

Bu səadət ikki aləmdə Əmaniğə yetər –
Kim, anın dik dilrüba, şuxi-pərisiması bar.

* * *

Gözümdin qılma ğayib təl'ətini, riqqətim artar,
Nə yalquz riqqətim kim, yüz bəlavü möhnətim artar.

Lətafət şivəsidə bar əcəb halət camalında,
Təəşşüq həddin ötüb, hər nəzərdə heyrətim artar.

Sözümni bilməyib layə'qəl olsam büləcəb irməs,
Ləbi-lə'lin təsəvvür eyləgəc keyfiyyətim artar.

Xəyalın bolğalı, cana, təbibi-cismi-bimarım,
Dəmadəm rəf tapıb natəvanlığ, söhbətim artar.

Mana bəs bu səadət mübtəlayi-hüsnün olmaqdin –
Kim, məhv olur küdurət, hər nəfəsdə işrətim artar.

Gəl, ey naseh, mana rüsvalıq içün pəndi moquf et,
Çü ol ətvardin aşiqlər içrə şöhrətim artar.

Nitərmin şadimanlığı bu dəhri-bisəbat içrə,
Ğəmi-eşqə, Əmani, çün dəmadəm ülfətim artar.

* * *

Ya rəb ki, bizim kibi giriftar
Barmola betəhti-çərxi-dəvvar?

Cananidin ayru candin olğan
Bizar besəd həzar azar?

Əyyami-vüsal həsrətidin
Müjganım irür həmişə xunbar.

Cüz naləvü zar həmzəbanım
Yox leylü nəhar hiç dəyyar.

Ahimdən ucan şərarələrdin
Əncüm yanubən düşər nigunsar.

Tez görməsə göz cahanda bizdin
Cananəmizi berəğmi-əğyar.

Mövcud vücudini Əmani,
Qoymaz beyəqin fəraqi asar.

* * *

Fəsli-dey getdivü gəldi novbahar,
Hicri təbdil etdi vəslə ruzigar.

Dilğəvü gözğə sürurü nur irür
Kamranlıq birlə görmək ruyi-yar.

Fürsət əldə var ikən hər bir dəmi
Tut ğənimət, ömrə yoxdur e’tibar.

Zərrə yanlığ biqərar olur könül,
Şol quyaş təl'ətlü bolğac aşikar.

Ğafil olma dəhridin kim, mehriğə
Bolmaq olmas bir nəfəs ümmidvar.

Ğeyri-yadi-dust qılma ömrü sərf,
Zinharü zinharü zinhar.

Ey Əmani, aşiq oldur kim, tapay
İzdihami-şövq birlə iştihar.

* * *

Hər ol aşiq ki, canan eşqidə zar olmadin qorxar,
Əzizliğ görməyə aləmdə çün xar olmadin qorxar.

Giriftari-həvayi-nəfs olubdur zahidi-xudbin,
Əcəb irməs, əgər eşqə giriftar olmadin qorxar.

Xəyalı allida daim ədəb mənzuri-könlümdür,
Gözətlər həddini bəndə, günəhkar olmadin qorxar.

İrür qane ki, dərdaşami-bənd olğay könül daim,
Meyi-qürb istəməs, əsrarı izhar olmadin qorxar.

Zəmani-vəsl aşiq eyləməs bitablığ əmdən,
Bekami-müddəi təğyiri-ətvar olmadin qorxar.

Anınçun abid olmas mubtəla zülfi-püraşubə,
Ridası Şeyx Sən'an kimi zünnar olmadin qorxar.

Təəmmülsüz nəzər qılmas Əmani yarını görgəc,
Göz ilə könlünü bir-birə əğyar olmadin qorxar.

* * *

Ayü gün təl'ətinə ayinədar,
Asitanın könülə dari-qərar.

Bizəbanlıqdin edə bilməsmin
Bir nəfəs dərdi-dilimni izhar.

Pövşən olğac elədi şəm'i-rüxün
Rövnəqi-mehrü məhi eynimə tar.

Asiman ilə zəmin dərhəm olur,
Ahü əfğan çəkicək bu dildar.

Həvəsim bar ki, qədəm külbəmğə
Hər zaman bassan, edəm canı nisar.

Yengidin öliğə can bergən dik,
Ya rəb, olğaymu tapam bəzminə bar?

Məstü layəqəl edər peyvəstə
Meyi-eşqin məni birənci-xumar.

Bir baxış birlə edibsin, cana,
Bişəkiba dili-şeydanı şikar.

Yalbarurmin səgi-kuyiğə müdam,
Yarlığını unudub etmə kənar.

Kamgar olsa Əmani, tan yox,
Köhl irür eyniğə kuyində ğübar.

* * *

Sabitqədəm olsa aşiqi-zar,
Didarını görsədür ona yar.

Hicran ğəmi aşiqə degil səb,
Gər tapsa vüsali-bəzmiğə bar.

Mə’şuq ilə aşiqin ədasın
Eşq eylədi aləm içrə izhar.

Ol kimsə bilür nədür təəşşüq,
Mənzuri-nəzərğə bar giriftar.

Ğayib olalı yüzü gözümğə
Mehr ənvarı dolubdurur tar.

Ol aşiqə eşq irür müsəlləm,
Öz halətidin degil xəbərdar.

Ya rəb, ğəmi-hicrdin, Əmani,
Barmola sənin kibi diləfgar?

* * *

Şami-hicranğa giriftar olğalı min könlü zar,
Şahrahi-intizarə qaldı çeşmi-əşkbar.

Ey könül aram, gəl kim, sənsiz eylər hər zaman
Ahü fəryadum zəminü asimanı tarümar.

Hər nəfəs çün yad edərmin pərtövi-şəmsi-rüxin,
Huşdin barub olurmin zərrə yanlığ biqərar.

Qasidin gərdi-səməndin sağınıb yüz zövq ilə,
Qarşular mürği-könül bolğac ğubarı aşikar.

Lalə dik bar gərçi həsrət dağı könlümdə bəsi,
Leyk iməs ğəm, çün irürmin vəslinə ümmidvar.

Ya rəb, andin yaxşı gün barmola ömr əyyamidə,
Yetgürəy həq vəslinə mən zarni, ey ğəmküsar.

Bar ümidüm həzrəti-izzətinin əltafiğə kim,
Berigəysin məqsədin nəxlidin, ey nikuşüar.

Yetmək üçün dövləti-vəsliğə ölməkdin bürun,
Yalbarurmin çərxinin tə'siriğə leylü nəhar.

Girdbadi-ğəm Əmani natəvanın cismini
Gül yüzün hicridə bərbad etdi misli-xüşk xar.

* * *

Eşqi ğəminin yadı bilə şadlığım var,
Ğövğayi-cəhan şüğlidin azadlığım var.

Rüsvalığı-eşqə əcəb irməs ələm olsam,
Peyvəstə bu adətğə çü mö'tadlığım var.

Köksümdə bolan dağlərin qanlu yarasın
Tırnaq ilə qazmaqda Fərhadlığım var.

Üşşaq, gəlib məndin edin kəsbi-ğəmi-eşq,
Bu sən'ətin adabidə ustadlığım var.

Bitablığım bolsa, ni tan, hər dəm, Əmani,
Şeydalığ ədasiğə çü imdadlığım var.

* * *

Yüz şükr berəğmi-çərxi-dəvvar,
İqbalə mübəddəl oldu idbar.

Xoş vaqe olubdur ittifaqı
Əyyami-bəhar vəsli-dildar.

Əlminnətüllilləh, oldu hasil
Kami-dili-biqərarü əfkar.

Ya rəb, bu mənəm ki, saldı sayə
Başumğa nihali-qaməti-yar?

Sərmayeyi-eyşü kamranlıq
Çün oldu müyəssər, ey dili-zar.

Bu haləti bilgilən ğənimət,
Dəhr eyləmədən xəyanət izhar.

Xoş fürsətdür, Əmani, etgil
Cananına nəqdi-ömrü isar.

* * *

Dilsitanimğə ki, canan dedilər,
Zülfünün küfriğə iman dedilər.

Qəddinin daliğə küttabi-əzəl
Can arasında yazılğan dedilər.

Bidilü zarü giriftarı anın
Bolğanı valehü heyran dedilər.

Eşq sərmayəsiğə yol tapdı,
Hər kimə bisərü saman dedilər.

Eşq adabidə mə’şuqəyə naz,
Aşiqə ah ilə əfğan dedilər.

Ey könül, kafirə cənnət bolğan
Dünyəni mö’minə zindan dedilər.

Görgəli hicr Əmani könülü
Halətin sə’b pərişan dedilər.

* * *

Gözüm nəzzareyi-cananın istər,
Məhəbbət dərdinin dərmanın istər.

Könülnün əndəlibi ahü əfğan
Tutub hər dəm güli-xəndanın istər.

Dürəfşan lə'lidin səm'im tapub kam,
Vüsal əyyamının tüğyanın istər.

Məşamım quti-ruh üçün həmişə
Şəmimi-türreyi-piçanın istər.

Zəmirim zülməti-hicri görüb məhv,
Tülui-nəyyiri-tabanın istər.

Xəyali-vəslü hicr ənduhi birlə
Təni-fərsudə min kim canın istər?

Təmaşasiğə gərm olğac Əmani
Xədəngi-ğəmzeyi-fəttanın istər.

* * *

Könül əfğan edib cananın istər,
Beğayət dərdi bar, dərmanın istər.

Gözün giryanlığı irməs əcəb kim,
Şügüftə ğönçeyi-xəndanın istər.

Kəməndi-mürği-ruh üçün dili-zar
Şikənci-türreyi-piçanın istər.

Ürək qanı təəşşüq aləmidin
Səhami-ğəmzənin peykanın istər.

Zəmirim müttəsil can ərsəsidə
Səməndi-nazının cövlanın istər.

Güli-rənayə bax kim, bülbülünün
Həmişə naləvü əfğanın istər.

Zəvali-möhnəti-hicran görüb can
Vüsal əyyamının tüğyanın istər.

Xəyali-zülfidə əjdər kibi dil
Məhəbbət gəncinin viranın istər.

Təəllüqsüz iməs heç kim cahanda
Əmani nəzminin divanın istər.

* * *

Ey məh, bəsərim arizi-tfbanını istər,
Eyni-nəzəri-nərgisi-məstanını istər.

Səm'üm daxi imayi-təbəssümlə təkəllüm
İzharın edən lə'li-dürəfşanını istər.

Can şamməsi nikməti-şəmmameyi-ənbər
Mənsuxun edən sibi-zənəxdanını istər.

Vəsfin deməgə natiqə tutisi xəyalın
Mir'atidə əksi-rüxi-pünhanını istər.

El tapmaq üçün lamisə xəttini izindin
Eyn üzrə rəvan sərvi-xuramanını istər.

Sinəmdə olan hafizənin qüvvəti üçün
Peyvəstə dil ahəngi-xoşəlhanını istər.

Sindin ni nihan; zayiqə zövqiçün Əmani
Vəhdət meyidin cür'eyi-ehsanını istər.

* * *

Ah ki, kar eylədi canimə azari-hicr,
Neyləyin, ey dustlər, bağəmi-düşvari-hicr.

Derlər idi bə'zi hal bolğay ölümdin betər
Bar imiş ol, ey rəfiq, möhnəti-bisyari-hicr.

Qayda bar, ey ney, qılay vəh, yenə sancıldı köp
Ğönçə sifət bağruma hər sarıdın xari-hicr.

Zə’fini dəf etməgə qılma əlac, ey təbib,
Çünkin, iməs cüz vüsal çareyi-bimari-hicr

Lütfi-ilah, eyləgəy tanla tamuqdin xilas,
Hər kimi göydü bu gün hirqət ilən nari-hicr.

Nəfs ilən etmək qital boldu çü şərti-xisal,
Hicrsiz olmas vüsal, bolmağil inkari-hicr.

Dəhri-sitəmkeş ara yoxdur Əmani kibi
Mö’təkifi-deyri-ğəm, zarü giriftari-hicr.

* * *

Bu fənadə beş gün üçün başda yüz sevda nədür?
Çün degil baqi, xəyali-məskənü mə’va nədür?

Ey xoş ol şeyda ki, canan eşqinin sevdasidin
Etməmiş idrak kim, dünya bilən üqba nədür?

Əksi-mir’ati-cəmalın hər nəfəs bir vəch ilə
Cilvəgər edər, günahi-aşiqi-şeyda nədür?

Öylə müstəğrəq bolubmin eşq istilasiğə –
Kim, könül məllahı bilməz sahilü dərya nədür?

Silki-əhli-eşqə sayılmaq dilərsin, ey könül,
Dərdə xürsənd ol, dəmadəm ahü vaveyla nədür?

Yox çü ümmidi-əsər nəşvü nümadin danlaqa,
Bülbülü-şeydayə, ey gül, munca istiğna nədür?

Qürb ümidi birlə canan kuyinin ətrafidə
Xakə yeksan ol, Əmani, özgə isti’da nədür?

* * *

Razi-nihan ərzinin zövqü qulağumdadur,
Lə’li-ləbi sormağun dadı dimağumdadur.

Ta bola candin rəməq tə’mi məzaq içrə bar,
Eşqidə rüsvalığın güllərin bağumdadur.

Hacət iməs şö’leyi-vadiyi-eyman mana,
Turi-təcəllalinin nuri çirağumdadur.

Dust beməsduqeyi-ayeyi-həblül-vərid
Bar yavuqdin yavuq, sanma irağumdadur.

Mə’siyəti xəlqdin əsramaq, ey dil, ni sud,
Əmr ilə küttabi-ğeyb sol bilə sağumdadur.

Eyləməgil, bağban, ərz təhəmmülni köp,
Hey’əti nəsrin, gülün pənbeyi-dağumdadur.

Bilmə sürahi bəsi boyuna əmrağ kim,
Saqi əgər lütf edər, başun əyağumdadur.

Xızr suyu ləzzətin istəyinə müjdə ver,
Eşq kəramətidin safı bulağumdadur.

Vadiyi-heyrətdə kim, bolsam, Əmani, ni tan,
Eşq ğəmi müttəsil çünki sorağumdadur.

* * *

Hər mərəz kim, cisim-dildari-vəfadarımdadur,
Möhnətü dərdi mənüm bu cani-əfkarımdadur.

Tabi-təbdin görgəli, cana, səni bitabvəş,
Ğüssədin yüz navəki-ğəm çeşmi-xunbarımdadur.

Eyləgil, ya rəb, təni-zarü nizarımğa nəsib
Hər küdurət kim, məzaci-nazənin yarımdadur.

Ya ilahül-aləmin, bergil şəfa cananimə,
Yüz pərişanlığ anın zə'fidin ətvarımdadur.

Möhnətimğə imdi zə'fi-yarni qılmış səbəb,
Ey Əmani, dəhri-dun çün daim azarımdadur.

* * *

Bizimlə yenə lütfünüz kəm bolubdur,
Anınçun kim, əğyar həmdəm bolubdur.

Yüzün mehridin nuryab olmamaqdin
Gözümğə bəsi tirə aləm bolubdur.

Nitərmin daği kamranlığını, cana,
Çü könlüm ğəmin birlə xürrəm bolubdur.

Müəssir irür naleyi-zarın, ey dil,
Bu əlhanə guya ki, məlhəm bolubdur.

Həzər əşkim əmvacidin qıl, rəfiqa –
Ki, hər qətrəsi bikərani-yəm bolubdur.

Təvafi-səri-kuyinə tapğalı yol,
Könül mürği mini-zardin rəm bolubdur.

Əmani, unut sərvqədlər xəyalın,
Çü üsyan yükidin qədin xəm bolubdur.

* * *

Ya rəb, bu mərəzdin yenə halum nolacaqdur?
Qürbətdə kəmal ilə zəvalum nolacaqdur?

Həsrət mana dünyadə həmin andin irür kim,
Məndin sona ol vəhşi ğəzalum nolacaqdur?

Yer altidə şol mənzili-məxfiğə barurcaq,
Bilmən ki, cavab ilə sualum nolacaqdur?

Üsyan yükidin həşr biyabanidə, ya rəb,
Əhvali-qədi-çəngmisalum nolacaqdur?

Yüz il bu cəhan içrə, Əmani, əgər olsam,
Həsrət ğəmidin özgə kəmalum nolacaqdur?

* * *

Xoşvəqt bol, ey dil, yenə canan gələcəkdir,
Nabud olan cism eviğə can gələcəkdür.

Hicran ələmidin, könüla, olma pərişan,
Çün aqibət ol nadiri-dövran gələcəkdür.

Bitab irür zərrə sifət can quşu daim
Ol zövqə ki, xurşidi-dirəxşan gələcəkdür.

Hicran gecəsi tirəliğidin yemənəm ğəm,
Axır yanıma çün məhi-taban gələcəkdür.

Bu ğönçə sifət könlümə ğəmxarı irür səhl,
Xürrəm yenə çün ol güli-xəndan gələcəkdür.

Punhan neçük olğay tələbim ğeyridin, ey dil,
Rəğmiğə anın yar-nümayan gələcəkdür.

Rəhm eylə Əmaniğə, əcəl, alma rəvanın,
Çün yaniğə ol sərvi-xuraman gələcəkdür.

* * *

Könül kim, eşqinin vabəstəsidür,
Məhəbbət bağının gül dəstəsidür.

Gərəkməs aşiqi-şeydayə zinət,
Çü aləm qeydinin varəstəsidür.

Təəşşuq övcidə bədrü hilalım
Yüzilə əbrüyi peyvəstəsidür.

Əyadətğə xəyalın qılsa mə'mur,
Tan irməs, aşiq anın xəstəsidür.

Səgi-kuyinğə verür can Əmani,
Qiyas et, sahibini nəstəsidür.

* * *

Hicran ara gözüm yaşı həsrəti-peykaridür,
Ahım səmumi atəşi-hirman şəraridür.

Canım fəda xəyaliğə cananımın bolğay –
Kim, mübtəla könlünün əzəldin qəraridür.

Məni-xaksar çöhrəsidin zail olmasun,
Şol toz ki, topcağı süminin yadigaridür.

Kəhhal tutiyasini yanında saxlasın,
Kəhli-bəsər mana səri-kuyi ğubaridür.

Heç növ şadimanlığı aləmdə istəmən,
Eşqi ğəmi həmişə çü dil ğəmküsaridür.

Damanına damarsa dəmadəm bu qanlu yaş,
Tan yox ki, hicr mövsümünün aləzaridür.

Nali-qələm dik eyləsə gər zə'f Əmanini,
İrməs əcəb ki, ğəm yemək anın şuaridür.

* * *

Könül bir mahsima sərvi-bala mübtəlasıdür –
Ki, can almaq təbəssüm birlə lə'linin ədasıdür.

Anınçun valehəm peyvəstə kim, ol şuxi-fəttanın
Gözü qaşı məlahət elminin əfsunnümasıdür.

Ğubari-astanın kim, xəvassın mehri-ənvərdin,
Əcəb irməs, füzun bilsəm, çü eynüm rövşənasıdür.

Müşəvvəşxatir olmasmin itabü nazidin hərgiz,
Çü ol şivə əzəldin zar könlüm müddəasıdür.

Nəsima, qılma zülfi-ənbərəfşanın pərişanvəş –
Ki, hər bir tarı min aşüftənin müşkülgüşasıdür.

Müfid irməs ətibba sə'yi, ey müşfiq, çü cananın
Məsih ənfası yanlığ ləğzi dərdimnin dəvasıdür.

Unutgil, ey Əmani, iki aləmdə könül rə'yin,
Təmənna hasil etmək gər sana anın rizasıdür.

* * *

Payeyi-hüsnə sütun saqidür,
Köhlümüz əyaqi tufraqidür.

Meyi-vəhdətğə əzəl ta beəbəd
Eyni-əltafı anın saqidür.

Qaş ilən eylər işarət, əmma
Ğafil olma ki, gözü yaqidür.

Canü dil yoliqə bersəm, ni əcəb
Tozi göz mərdüminin aqidür.

Edər itiqə təməllüq könlüm,
Çün vəfa tövridə müştaqidür.

Bülbüla, bolmaqilən bəs məğrur,
Yel uçurqan gülün övraqidür.

Bolma əfsürdə, Əmani, zinhar,
Söhbəti gərm eləmək çaqidür.

* * *

Xəyılın, nazənina, ğəmküsarum, çarəsazumdur,
Ənisüm, munisüm, arami-canım, dilnəvazumdur.

Ğəmi-eşqin bərabər dünyəvü üqbağə qılmasmin,
Anınçun kim, qədimi məhrəmi-hər gizli razumdur.

Gər etsə həddin istilayi-şövqüm büləcəb irməs,
Əzəldin aşiqə bitablığ çün şərti-lazımdur.

Pərişan qılma, cana, şanə birlə cə'di-mişkinin –
Ki, hər bir tarının piçü xəmi ömri-dirazumdur.

Degil baran baharan kuyinin ətrafidə, ey gül,
Təhəssürlər pərişan eyləgən əşki-niyazumdur.

Cahanda aqibət Mahmud bolsam, tan iməs, cana,
Cəmalın çünki mənzuri-nəzər bolğan Əyazumdur.

Əmaniğə yetər, cana, bu dövlət kim, dedin görgəc:
Əsiri-nərgisani-sehrsazi-işvəbazumdur.

* * *

Tutan piramənimni sənsiz, ey məh, qanlu yaşumdur,
Cigər xunab həsrət xanidin peyvəstə aşumdur.

Məlahət taşidin irməs mini-dilçakinin baki,
Çü fərşi asitanın gecələr balini-başumdur.

Bolubmin şadmanlıq birlə ğəmdin daim azadə,
Xəyalın çün əzəl təqsimidə vəchi-məaşumdur.

Əcəb yox tilbələr dik ağlamaq əsnasidə gülmək,
Xəyali-vəsldin hicr içrə bolğan intiaşumdur.

Quyaşum guşeyi-bamiğə dün gecə tülu eyləb,
Hilali-eydini görgəc dedi: şol, əksi-qaşumdur.

Məni şuridəliğdin mən qılmın, ey müsəlmanlar,
Könülnü bütpərəsti-məst edən şol bağrıtaşumdur.

Tan irməs gər Əmani dik qərarum bolmasa, cana,
Təəşşüqdin könüldür zərrəvü eşqin quyaşumdur.

* * *

Ol güli-rə’na ki, könlüm bülbüli-nalanıdur,
Valehü heyranıyam kim, canımın cananıdur.

Gər xərab eylərsə gər mə’mur könlüm kişvərin,
İxtiyar anın irür, çün müstəqil sultanıdur.

Sə’y qılma, çün müfid irməs əlacın, ey təbib,
Ol məsihadəm vüsalı dərdimin dərmanıdur.

Etməgil təklifi-seyr, ey bağban, cananəsiz,
Bağü bostan natəvan canü dilin zindanıdur.

Lilləhilhəmd, ey Əmani, valehəm bir ayağa kim,
Mehri-aləmtab əksi-arizi-tabanıdur.

* * *

Xürrəm olgil, ey könül kim, novbəhar əyyamıdur,
Səbzeyi-novxizlər, eyşü tərəb ərqamıdur.

Zahir olğan dəmbədəm qamət xəmi əşcardin,
Xəl’əti-əxzər kəramət olmağın ikramıdur.

Sayeyi-çətri-şükufə rahəti-ruh olduğu
Bardur aydın kim, yədi-qüdrət anın xəyyamıdur.

Quşların əlhanı, ey dil, bəs müəssirdür bu fəsl.
Guyiya kim, hər birinin nəğməsi ilhamıdur.

Şadman ol, bülbüli-nalan ki, hicran rəğmiğə
Ğönçə bərgi vəsli gülün rüq'eyi-peyğamıdur.

Səbzəvü abi-rəvanındin nə hasil, bağban,
Arizuyi-dil çü yarın arizi-gülfamıdur.

Hər kimin bir arizusu bar, Əmani zarının
Canfəşanlığ məqdəmi-canana qılmaq kamıdur.

* * *

Eşq əsləhəsi qurşanın axır şüca olur,
Andin ki, bu müamiləyə can məta olur.

Varlığını nisar edəni saymağıl əbəs –
Kim, bu sifat ona əbədi intifa olur.

Hər dəmdə yüz cəfa yetirürsə könülğə yar,
Sayman ki, zərrəvar vəfa inqita olur.

Eşqin ğəmin şərakət ilən zəbt qılmağa
Canü könül arasidə hər dəm niza olur.

İzhari-dərd eyləyə bilməs əsiri-zar,
Təqriri istima yeriğə süda olur.

Ey kim, təqərrüb ilə tapıbsin təhəmmülü,
Ğafil həm olma, əksi anın imtina olur.

Məğruri-vəz olmamaq övla irür, könül,
Gər ittifaq ilən neçə gün irtifa olur.

Xət zeylidə yüzün görigəc söylədüm: nədür?
Dedi kim, anın axırı təhtəş-şüa olur.

Bir riştə tut, Əmani ki, tapmas güsəstliğ,
Hər vəslin axırın çü görürsən vida olur.

* * *

Seyli-müjəmni valehi-didar olan bilür,
Könlüm ğəmini vaqifi-əsrar olan bilür.

Gər yetməsəm məqasidə xürsəndəm, ey rəfiq –
Kim, canda bolğan arizumu yar olan bilür.

Canan vüsali həsrətidin zə’fi-cismimi
Məhcürü mübtəlavəşü bimar olan bilür.

Gər halətimni bilməsə bidərdlər, ni ğəm,
Bu bəsdürür ki, zarü diləfkar olan bilür.

Zəxmimğə, ey təbib, iməs mərhəmin müfid,
Anın əlacını gözü xunxar olan bilür.

Rüsvayi-eşq olanları, ey zahid, etmə mən’
Hər bəndə könlü sirrini səttar olan bilür.

Zövqini küfri-zülfi-nigarın, Əmaniya,
Sən’an sifət miyanidə zünnar olan bilür.

* * *

İqbali-vəsl qədrini hicran çəkən bilür,
İdbari-mərg halətini can çəkən bilür.

Hər ləhzəni min ilcə deməgin hesabını
Hicran tünidə ah ilə əfğan çəkən bilür.

Canü dili-əsirü giriftar halətin
Dörd iqlimidə həsrəti-dərman çəkən bilür.

Köksüm xədənginin hədəfi olduğunu ğeyr
Bilmək degil səlah, çü peykan çəkən bilür.

Eşqində xarlığ səbəbi-izzət olmaqın,
Ehram fəsli zəxmi-müğilan çəkən bilür.

Öz guşəsində tuşə bilə xirqə ləzzətin
Sərgəştəliğ bekuhü biyaban çəkən bilür.

Qan yudmaqın, Əmani, irür özgə haləti,
Bu zövqü sanma badeyi-rümman çəkən bilür.

* * *

Təvəkkül ixtiyar etgil kim, andin nik məqam olmaz,
Müyəssər bolmadin ol şivə nəfsi-şum ram olmaz.

Neçük bergəy firib əhli-həqə maye'rif dünya –
Ki, hərgiz şahbazə ənkəbutin tari dam olmaz.

Xoşa ol valehi-şeyda, riza canan rizasinğə
Bermib, öz cananidin könlümdə idrak kam olmaz.

Sənindür çünki fürsət, ədlü insafı ğənimət bil –
Ki, məzlum ahi dik bir kargər möhliksiham olmaz.

İnam irür mərəz əhli təbibi-haziqi hakim,
Əgər təşxisə təxfif olsa, aləmdə nizam olmaz.

Əməl tulini qoy, saleh, əməl qılgil bu aləmdə,
Bəqayi-əmri bibünyadə çün axır dəvam olmaz.

Əmani, qane olgil, incimə, gər bulmasan məqsəd,
Bu naqis dəhr ara çün heç kimin işi təmam olmaz.

* * *

Ah kim, zarü nizarəm yarsız,
Təlxkam ol lə'li-şəkkərbarsız.

Mehri-ənvər zərrədin həm xirədür
Eynimə ol nərgisi-xummarsız.

Sancılıbdur ğönçə yalnığ könlümə
Xarlar ol sərvi-gülrüxsarsız.

Rahətim təbdil olubdur möhnətə
Vadiyi-həsrət ara dildarsız.

Bülbül, olma xardin azürdədil,
Mümkün irməs kim, gül ola xarsız.

Çün könül verdin, onun rə'yincə ol,
Ta adun sayılmaya iqrarsız.

Necə bolğay hal, Əmani kim, fələk
İstəməz bir dəm bizi azarsız.

* * *

Görməmək irməs əcəb yarni əğyarsız,
Çün kim, iməs hiç gül aləm ara xarsız.

Billah, iməs dilpəzir söhbəti-qılmanü hur
Rvzeyi-rizvan ara dövləti-didarsız.

Bağın ara, bağban, ər'ərü şümşad sevər
Xar irür eynimə ol qədü rəftarsız.

Eşqdə zarü nizar olğan iməs bir nəfəs
Ta ki, cahan içrə bar möhnətü azarsız.

Pənd iməs sudmənd talibi-mətlubğə,
Tərk edübən nəngü nam, çün kim, olur arsız.

Şe'rini, şair, demək hər kimə mərğub iməs,
Bənzər ona kim, ola cinsi xəridarsız.

Hər sifət ilən cəfa etsə, Əmani, vəfa
Göstər ona, ta sənə deməyə iqrarsız.

* * *

Yüz tuman möhnət ilən qalmışam, ey can, sənsiz,
Dünü gün könlüm edər naləvü əfğan sənsiz.

Tanriçün, ey qədi tuba, yüzü gül, zülfü səmən,
Yetə gör, göydü məni atəşi-hicran sənsiz.

Hicr vadisidə ğamxarləridin, ey gül,
Yürəgüm ğönçə sifət boldu, tola qan sənsiz.

Könülə lalə tügün, didəğə gül boldu tikən,
Seyri-bağ etməsəm, ey sərvi-xuraman, sənsiz.

Ömr yüz möhnət ilən keçdi, vəli bilməsmin,
Aqibət necə bolam bidilü nalan sənsiz.

Şərh edər cənnəti vaiz, vəli bilməs anı kim,
Eyləməs meyl ona aşiqi-heyran sənsiz.

Etməsən rəhm Əmaniğə, anı hicr ğəmi
Varlığındin yox edər, ey məhi-taban, sənsiz.

* * *

Fəğan kim, hiçgəh mən zardin yad etmədin hərgiz,
Fəmin könlümni bir məktub ilən şad etmədin hərgiz.

Könül mülki ki, hicran zülmidin viranə bolmuşdur,
Əlarəğmi-ədu vəsl ilən abad etmədin hərgiz.

Sana daim müyəssər boldu Şirin vəsli, ey Xosrov,
Vəli bu şükrə bir gün yadi-Fərhad etmədin hərgiz,

Nə hikmətdür bu, ya rəb, ey sipəhri-duni-bihəmta
Ki, eşq əhlin bəlayi-ğəmdin azad etmədin hərgiz?

Əmani, eşq ara ğəm möhnətin çəkmək müsəlləmdür
Sana kim, munca ğəm bidadidin dad etmədin hərgiz.

* * *

Ya rəb, axır necə bolğay halımız?
Qövlqə sadiq iməs əf’alımız.

Aqibət çün kim, yaman-yaxşı keçər,
Səhl irür idbar ilə iqbalımız.

Ömrə bir qılca çü yoxdur e’timad,
Bolmamaq olay bu qilü qalımız?

Həstliq çün faniyi-mütləq tapar,
Hiçə dönər munca istiqlalımız.

Dünyəvü üqbadə eylər bizni xar
Bu xəyali-fasidi-ibtalımız.

Dərdü ğəm çəkməkdin əsla incimə,
Böylə gəlmiş çün əzəldin falımız.

Ey Əmani, şərhi-üsyan səbtidin
Doldu axır nameyi-ə’malımız.

* * *

Rişteyi-canım kəməndi-zülfiğə bənd eyləniz,
Cani-zarimni bu peyvənd ilə xürsənd eyləniz.

Kuyidə könlüm quşun qaçurmışam, ey dustlar,
Həq rizasiçün anı tapmağa bir fənd eyləniz.

Aşiqə, nasehlər, irməs pənd çün kim sudmənd,
Qoyun öz haliğə, tərki-şiveyi-pənd eyləniz.

Kuyi-əhramidin özgə arizu gər eyləsəm,
İtləriçün cismimi pərkənd-pərkənd eyləniz.

Üstüxani-cismim ol çabüksüvar eyləb hədəf,
Necə kim, sındırsa oxun daği peyvənd eyləniz.

Lə'li yadı birlə əşkimdin açılğan güllərin
Bərglərnin igləyib övraqi-gülqənd eyləniz.

Ləbğə canın çün yetürmişdür Əmani zövqidin,
Zəhri-çeşm ilə anın sarı şəkərxənd eyləniz.

***

Cana, bizimlə həmsəfər olmuş xəyalınız,
Ümmidvarəm olsa müyəssər vüsalınız.

Zəhri-fəraq məhv olurdu məzaqdin,
Məsmuim olsa gər yenə şirin məqalınız.

Ta bardurur həyat mana bu cahan ara,
Başımdin əksük olmaya, ya rəb, zülalınız.

Əyyami-ömr kami-dil ilə köçüb müdam,
Eyşü hüzurə sərf ola mah ilə salınız.

İnsü məlıəkni etməgə heyranü biqərar
Nəqqaşi-sün' türfə çəkibdür cəmalınız.

Can mürğiğə müyəssər iməs qeyddin xilas,
Olmuş çü damü danə ona zülfü xalınız.

Sərvü sənubərə səbəbi-infial olur,
Bolğac rəvan nihali-qədi-e'tidalınız.

Kuyi-ğubariğə qarışıb olunuz nisar,
Ey canü dil, əgər tüşər olsa məcalınız.

Bolsaq Əmani yanlığ əgər xaki-rəh, ni ğəm,
Sədri-məalidür bizə səffi-nialınız.

***

Eşq rüsvaləriğə yoladaşuz,
Laübaliyü rindü ovbaşuz.

Xublər sevdügüm görüb dedilər:
Ol quyaş var, biz çü xəffaşuz.

Mün'ima, himmət olğac irməs ğəm,
Qaç gün ər binəvavü qəllaşuz.

Gözü qaşü üzarü xalü xəti
Göricək həsri nəqşi-nəqqaşuz.

Bu səadət, Əmaniya, bizə bəs,
Cə'fəriməzhəbü qızılbaşuz.

***

Vadiyi-heyrətdə qaluxlardanuz,
Atəşi-həsrətdə yanuxlardanuz.

Tan iməs ər tanımasaq mütribi,
Balü pəri-eyşi yoluxlardanuz.

Zahir ara gərçi iraqüz, vəli,
Aləmi-batində yavuxlardanuz.

Mənligi məhv eyləmək övla, çü biz
Aqibətül-əmrdə yollardanuz.

Gərmdilüz eşq odidin, zahida,
Sanma sənin kibi savuxlardanuz.

Gərçi səzavari-əzab olmuşuz,
Yazuqi əfv eylə, yazuxlardanuz.

Bardur, Əmani, bütün iqrarımız,
Noldu əgər könlü sınuxlardanuz.

* * *

Üryan tənə mündəris əba bəs,
Fərş etməgə xiştü buriya bəs.

Əhli-həqə nəfsinin şikəsti
Dünya bilə üqbadə ğiza bəs.

Xətti-dilü dilə dərdi-eşqin
Şeydasiğə ah ilə büka bəs.

Cananə rizasidür çü məqsud,
Ey dil, sənə tərki-müddəa bəs.

Sərmayeyi-nur irür cəmalı,
Canü dilə andin incila bəs.

Zikr eyləgil adını həmişə –
Kim, ol sənə dafeül-bəla bəs.

Biganə gər olsa xəlq, Əmani,
Kuyi-iti bizgə aşina bəs.

* * *

Aşiqə eşqinin nişanı bəs,
Naləvü ahi-həmzəbanı bəs.

Yarının mübtəlayi-hüsniğə
Lütfü ehsanı, dilsitanı bəs.

Gər zəmiriğə, ey könül, məzkur
Eyləsə bizni, kamranı bəs.

Saysa, ey dil, bizi səgi-kuyi,
Lütfi-peydasivü nihanı bəs.

Hicri təbdil vəslğə görmək
Hasili-ömrü zindəganı bəs.

Bavücudi-vüsal gül fəsli
Əndəlib eyləməs fəğanı bəs.

Ey Əmani, anın nihani ğəmi,
Könülə eyşi-cavidanı bəs.

* * *

Mən kibi Məcnun cünun vadisidə şeyda iməs,
Dilsitanım nazü istiğnasidə Leyla iməs.

Gər apardı bir nəzərdə varlığımni gözləri,
Büləcəb sanma, könül kim, türk biyəğma iməs.

Tut əlim, ta kim, olam üftanü xizan ruberu,
Ey igit, min dik çü piri-natəvan peyda iməs.

Asimana, bolmağıl məğrur ay günğə köp,
Anlara mindin biri yarım kibi sima iməs.

Yar müstəğnivü dil bitabü müstə'cəl əcəl,
Cümləğə bu gün ğəmi-fərda üçün pərva iməs.

Həbbəza ol valehi-heyran ki, canan eşqidin
İki aləm arizusu könlidə qət'i iməs.

Ahü əfğan çün irür üşşaq ara bəs binəva,
Dərdə səbr eylə, Əmani, hacəti-ğövğa iməs.

* * *

Çünki canan eynü dildin ğeyb iməs,
Arizuyi-vəsl qılmaq eyb iməs.

Aşiqi-sadiq tapar bəzmi-vüsal,
Ey könül, bu sözgə şəkkü reyb iməs.

Zahir olğan rəxnə aşiq yanidə
Zəxmi-pünhan rövzənidür, ceyb iməs.

Salik olur bisədə çün müstəmə,
Ona hacət hatifi-lareyb iməs.

Ey Əmani, vəqti bilgil müğtənəm,
Çün şəbab heç kimğə bə'di-şeyb iməs.

* * *

Yox əcəb, gər məni canan belə heyran bilməs,
Bülbüli-zarni nalan güli-xəndan bilməs.

Özgə xublarğa nə nisbət qədü rüxsarı anın
Sərvü gül şivəsini xari-biyaban bilməs.

Yardin ayru könül halı beeynə bənzər
Bizəban tiflə ki, cüz naləvü əfğan bilməs.

Kim ki, heyrani-qədü yüzü gözü xətt oldu,
Bil yəqin sərvü gülü nərgisü reyhan bilməs.

Ey xoş ol aşiqi-şeyda, bu fəna dünyadə
Eşq sövdasidin özgə sərü saman bilməs.

Ey könül, incimə dərvişliğin vəz'idin,
Bu səfa ləzzətini qeysərü xaqan bilməs.

Bolsa məhbuc Əmani, nə əcəb, görgəc anı,
Vəsl adabını ol zari-pərişan bilməs.

* * *

Quyaşğa gər müqabil bolsa xəffaş,
İməs mümkün çəkə nəqşini nəqqaş.

Olubdur rəxnə gər cismim evinğə
Gözüm fəvvarəsidin taşlanan yaş.

İki aləmdə bolğaydur sərəfraz
Türabi-astanın bulsa hər baş.

Qamu işdin bolubmin fariğül-bal.
Xəyalın bolğalı könlümğə yoldaş.

Saçar qapunda göz yaşın Əmani,
Nəsimi-sübhdəm bolğanda fərraş.

* * *

Cəmalın mahi-taban, ey pərivəş,
Qədin sərvi-xuraman, ey pərivəş.

Xəncil bolmuş nəzakət kişvərində
Ləbindin abi-heyvan, ey pərivəş.

Yüz üzrə daneyi-xalın beeynə
İrür zaği-gülüstan, ey pərivəş.

Sərapa eyləmək tə’rifin izhar
İməs til həddi imkan, ey pərivəş.

Sənin dik nazənin görmüpdürür heç
Pərirulərdə dövran, ey pərivəş.

Həmişə saxlasun dəhr afətidin
Səni zillidə sübhan, ey pərivəş.

Bəsi bardur əsirin, leyk mən dik
Degil heç qaysı nalan, ey pərivəş.

Səni çün beyti-əhzanidə görsəm,
Könül kamidə mehman, ey pərivəş.

Əmani dik qılurmən əz səri-sidq
Nisari-məqdəmin can, ey pərivəş.

* * *

Xarlər kim, ənbəri-tər bilə tərtib eyləmiş,
Danələr can mürğinin qəsdiğə tərkib eyləmiş.

Ni müqəyyəş cədvəl olmuş səfheyi-rüxsariğə,
Zərvərəq həm qaşı misraini təzhib eyləmiş.

Naşəkib etməgə bizni halə tutmuş ay kibi,
Atəşin gül dövrünü sünbül bilən zib eyləmiş.

Ol ki, bermiş hüsniğə zibalığı həddin füzun,
Ğarəti-canü dil üçün türfə təğrib eyləmiş.

Bidilü məhcur Əmani eşq dərdin qoymağa
Hər tərəfdə xəl'əti-cismiğə yüz cib eyləmiş.

* * *

Dil təvafi-Kə'beyi-kuyiğə ehram eyləmiş,
Eyləsün iyzəd müyəssər, hər nə kim, kam eyləmiş.

İki səyyadı bilə seyd etmək üçün can quşun
Ariz üzrə xəttü xalın danəvü dam eyləmiş.

Tubivü huri qədü yüzü xəyalidə anın
Cənnətül-mə'va ara izhari-ilzam eyləmiş.

Gözlərim olmuş ləbaləb qəlteyn dik əşk ilə
Rəşkdin ol dəm ki, canan meyli-həmmam eyləmiş.

Ey Əmani, barcə xublərdin füzun bermiş ona
Hüsnü xülqi həzrəti-biçun, çü əqsam eyləmiş.

* * *

Ətri-rühəfza ki, derlər zülfi-ənbərbar imiş,
Rişteyi-ümmid andin dilqə hər bir tar imiş.

Əqlü huşü dinü dil, səbrü qərarım gözləri
Bir nəzərdə eylədi tarac, xoş əyyar imiş.

Öz-özüm birlə tərənnüm bülbülasa eylərəm,
Çün təəşşüq xar-xarı aşiqə gülzar imiş.

Dedilər: kuyində bar bir valehi-şeydayi-zar,
Eyləgəc təhqiq bildük kim, dili-əfkar imiş.

Şeyb əyyamı şəbabın halətini göstərür,
Mücmələn kim, eşq şeydalığı xoş ətvar imiş.

Bir gül üçün pərvəriş yüz xara ber kömlək məsəl
Aşiqə hər kimsədin çəkmək cəfa naçar imiş.

Gər tutuşsaq, tan iməs, rüsvalıq otinğə müdam,
Aşiqi-bitabğə namus nəngü ar imiş.

Bolma, ey dil, müddəilər hiyləsidin bimnak,
Çün əzəl gündin bizimlə lütfü yarın bar imiş.

* * *

Canan ğəmi kim, bu dili-nalanə ulaşmış,
Nisbət irür ol gəncə ki, viranə ulaşmış,

Şeydayi könül birlə ğəmin demək olur kim,
Bir tifl barıb arifi-ürfanə ulaşmış.

Bəzmidə məni-zarı görənlər dedilər kim,
Dərviş əcəb vəz ilə sultanə ulaşmış?

Can verdügimi tövfidə görgəc dedi ol şux:
Pərvanə məgər şəm'i-şəbistanə ulaşmış?

Yüz şükr ki, aşiqlər ara söylənəcəkdür:
Ol zar berib canını canana ulaşmış.

Şeydalığı təğyir edəməz hərgiz Əmani,
Ol şivə barıb çün könülü canə ulaşmış.

* * *

Çü sevdügüm iki aləmdə bimisal olmuş,
Könlüğə eşqi anın mehri-bizəval olmuş.

Dila, kəmalə nə nöqsan yetər bu bəzm içrə,
Məqami-ariyəti gər səfi-nial olmuş.

Gər arizuyi-tərəb qılmasam, əcəb irməs,
Çü mürği-dil ğəm əlindən şikəstəbal olmuş.

Bahar fəslidə nalan bolalı həzarani
Xəzan zəmanidə gör necə gəngü lal olmuş.

Fəraq zə'fidə cismim ara bolan rəglər
Örümcək eviğə bənzər ki, payimal olmuş.

Çü cism xak olur aqibət, libasini
Müsavi saygilən ətləsvə gər nə şal olmuş.

Cəfayi-dəhr bəsi kimsələrni etdi həlak,
Həmin nə yalquz Əmani füsürdəhal olmuş.

* * *

Aşiqi ğəmdin edər yarı xilas,
Öylə kim, bülbülü gülzarı xilas.

Lilləhilhəmd ki, hicran əlidin
Etdi vəsli dili-əfkarı xilas.

Bö'dinin zillətidin izzəti-qürb
Etdi min zari-giriftari xilas.

Əbədi şad olacaqdur ğəmdin,
Hər kimi eyləsə dildarı xilas.

Eylədi ikki cəhan fikrətidin
Mini didarının ənzarı xilas.

Əşkü ah, abü həvası qıldı
Zə'fidin aşiqi-bimarı xilas.

Əhli-aləmini pərişanlıqidin
Eyləmiş türreyi-tərrarı xilas.

Eylədi dünyəvü mafihadin
Aşiqi şiveyi-biarı xilas.

Ey Əmani, məni qan yudmaqdin
Qıldı şol ğəmzeyi-xunxarı xilas.

* * *

Ey səba, halımı qıl yarıma ərz,
Dilimin dərdini dildarıma ərz.

Çəkdügim möhnəti-hicran sitəmin
Edə gör ğəmzəsi xunxarıma ərz.

Necə bir şərh ğəmümni eləsün
Cani-nalan dili-əfgarıma ərz?

Bu məratibğə fələkdin yetdüm
Halum iqbal edər idbarıma ərz.

Ey Əmani, mana bu fəxr yetər,
Edərəm sirrimi səttarıma ərz.

* * *

Kəsbi-eşq etməkdür insandin ğərəz,
Tanımaq cananını candin ğərəz.

Təl'əti-mir'atinin əksin əyan
Eyləməkdür mehri-rəxşandin ğərəz.

Əndəlibi-mübtəlayi-zarğə
Gül yüzün görməkdür əfğanidin ğərəz.

Arizü rüxsarü xətt imzasidür
Laləvü nəsrinü reyhandin ğərəz.

Qədrü miqdarın vüsalın bilməgə
Bar imiş aləmdə hicrandin ğərəz.

Cüz sifati-lə'li-canbəxşi iməs,
Xızr içgən abi-heyvandin ğərəz.

Ey Əmani, qəddü rəftarı irür
Yarının sərvi-xuramandin ğərəz.

* * *

Lilləhilhəmd, etdi mən zar ilə canan ixtilat,
Ğeyrinin rəğmiğə boldu dərdə dərman ixtilat.

Bimi-hicrandin iməs minbə'd könlüm içrə ğəm,
Çün müyəssər oldu öz əltafi-yəzdan ixtilat.

Xublar əksər bolurlar hər kişiğə aşina,
Şükrülilləh, olmadı ol məh pərişan ixtilat.

Andin artıq barmola, ya rəb, səadət aşiqə –
Kim, edə könlündəki müşkülnü asan ixtilat.

Bar ümidüm kim, rəvan nəqdi bolay yüz zövq ilə,
Nagəhan isar ol dildari-həsban ixtilat.

Misli-guyi-nüğrəvü çövgani-pürxəm dəmbədəm
Ol zənəxdan birlə edər zülfi-piçan ixtilat.

Ey Əmani, çün təkəllüm başlar ol məhvəş, edər
Lə'li-xəndan birlə guya dürri-ğəltan ixtilat.

* * *

Ləblərindən qılsan izhar, ey büti-əyyar, ləfz,
Canımın guşiğə olur lö'lüyi-şəhvar ləfz.

Zahir eylər mö'cizi-İsiyyi-Məryəm bigüman,
Eyləsə vəqti-təkəllüm gər tilin təkrar ləfz.

Baği-hüsnünğə ki, baxmaq heç gözün həddi iməs,
Ğonçeyi-xəndani-guyası gətirmiş bar ləfz.

Aşiqi-bitabə yoxdur xardıqdin hiç ar,
Öziğə izzət bilür hərçənd eşitsə xar ləfz.

Necə kim, məqdur irür, ləfzi yamandin əsrə qıl,
Yetirür hər kimsəğə çün rahətü azar ləfz.

Sərf qılmaq ləfzi hər latayilə cayiz degil,
Cism ara çün xeyli-ə'zayə irür sərdar ləfz.

Qılma izhari-təəşşüqni, Əmani, zinhar,
Baisi-tərki-ədəbdür çünki bihəncar ləfz.

* * *

Yox iki dünyadə canan yanlığ,
Zarü heyranı anın can yanlığ.

Hiç cəmiyyətxatir irməs
Könülə zülfi-pərişan yanlığ.

Eşq adabidə xətti-üşşaq
Bulmamış naləvü əfğan yanlığ.

Gül savıldıvü xəzan yetdi, netəy,
Qalmışam bülbüli-nalan yanlığ.

Çak-çak eylədi hicran tiği
Cismi-zarimni giriban yanlığ.

Barmola hiç hərarət, ya rəb,
Suznak atəşi-hicran yanlığ.

Bikəran bəhr, Əmani, yoxdur,
Dəhr ara dideyi-giryan yanlığ.

* * *

Ləbi-lə'lin çü qılğac dürfəşanlığ,
Berür ölüğə İsa dik rəvanlığ.

Xəbər səm'imğə yetsə məqdəmindin,
Berürmin canı cana, müjdəganlığ.

Bolubsin ğayib ər gözdin, dəmadəm
Xəyalın göndərürsin ərməğanlığ.

Degil zibəndə əyyamı baharın,
Çü bərgi-eyşimiz bulmuş xəzanlığ.

Nəsihət sudmənd, ey naseh, irməs,
Çü yox rüsvalığa heç növ danlığ.

Əyağdin, ey igit, tüşsəm degil eyb,
Qarılıqda tan irməs natəvanlığ.

Əmani, qıl həzər imkasdin kim,
İrür bədnamlığdin yeg ziyanlığ.

* * *

Necük bolsun könüldə şadimanlığ,
Çü dersin umma məndin mehribanlığ?

Bu yanlığ ömr ötərsə həstliğdin,
Yəqin kim, ənqərib qalmas nişanlığ.

Bənim halımni, cana çün bilürsin
Əzəldin aşikaravü nihanlığ.

Edibsin azmayişlər mükərrər,
Nədindür şimdi, ya rəb, imtəhanlığ?

Tərəhhüm qıl, tərəhhüm qıl, tərəhhüm,
Başımçun eylə tərki-bədgümanlığ.

Könüldə xar-xari-ğəm çü bardur,
İrür zindan gözümğə gülsitanlığ.

Nə hasil, ey Əmani, arizudin,
Keçəydür çünki əyyami-cəvanlığ.

* * *

Bar mir'ati-zəmiri çün saf,
Eyləməs mərd olan hərgiz laf.

Adəti ğeyri-təvəkkül irməs,
Bar müsavi ona bəzm ilə məsaf.

Şivəsi rastlıq irür daim,
Cari olmas tilğə ləfzi-gəzaf.

Xeyrxahi-qamu xəlq olmaq üçün
Tutmas heç əmrdə özünü mə'af.

Sidqi kamil çü irür kafili-rizq,
Bilmüzaif yetirür vəchi-kəfaf.

Həq rizasiğə salıbdur rə'yin,
İstəməs cənnətü duzəx e'raf.

Bu sifətliğni, Əmani, görsən,
İzinin tozuni qıl eyninə şaf.

* * *

Sünbül gül üzrə qıldın çün pərişan hər tərəf,
Oldular canü könül şeydavü heyran hər tərəf.

İki kövkəbdür dirəxşan, ayğa bolmuşlar qərin,
Guşuna, cana kim, astın dürri-ğəltan hər tərəf.

Gülşəni-kuyin irür xoş rühpərvər, dilgüşa,
Anda bardur batərənnüm sədhəzaran hər tərəf.

Dinü iman afəti olmuş, könülğə, bolğalı
Səfheyi-rüxsarın üzrə xət nümayan hər tərəf.

Keşti ömrü arizuyi-dilğə bir dəm yetmədüm,
Qalmışam nalanü giryan, kamcuyan hər tərəf.

Tilbəliğdə barmola heç mən kibi bu dəhr ara
Parə-parə eyləgən cibü giriban hər tərəf?

Ey Əmani, yatmagil, həngami-sübh asıb qulaq,
Bil məasir quşların zikrin beəlhan hər tərəf.

* * *

Dəhr ara barmola bir mən kibi bimarü zəif,
Müttəsil hicrə giriftar bolan zari-nəhif?

Ah kim, mən kimi yoxdur bu cahan əslində
Sərf edən tuli-əməl şivəsiğə ömri-şərif.

Xatirim bolsa pərişan, əcəb irməs, etmiş
Dili-divanəni sövdazədə şol zülfi-ləfif.

Məhv olur səbrü qərarü xirədü huş təmam,
Eşq şeydalığı hər aşiqə kim, bolsa hərif.

Kim ki, dünyayi-dəni cifəsiğə berdi könül,
Görünür əhli-bəsirətğə anın vəsfi kəsif...

Tərki-tuli-əməl etməkdür, Əmani, olay,
Çün əcəl birlə əməl bir-biriğə oldu rədif.

***

Aşiqin gözdin axan qaniğə bax.
Qan ilə aludə damaniğə bax.

Sidq üzidin bir nəzər didar üçün
Can nisar etgəndə cananiğə bax.

Bağibana, hasili-ömr istəsən,
Bağ ara sərvi-xuramaniğə bax.

Can hədəf etgəni görmək istəsən,
Ğəmzəsinin oxu peykaniğə bax.

Heç kimə göstərmədi tövri-vəfa,
Bu fələknin vəz'i-dövraniğə bax.

Tilbə könlüm dəhrü mafihasiğə
Küfri-zülfün bermiş imaniğə bax.

Ey Əmani, eşq istilasidin
Könlümün fəryadü əfğaniğə bax.

***

Bu fəsli-baharın yenə xoş çağına bax,
Bağ içrə şükufələrnin iqranına bax.

Bir sərvqəddi-səmənü bir laləüzar
Naz ilə xuraman olıcaq sağına bax.

Ol şuxi-pəripeykəri-gülrüxsarın
Divanə olan aşiqi-müştağına bax.

Mehrabi-könül eyniğə bolğan əzəlidin,
Göz ucidə əbrulərinin tağına bax.

Rəngin yürəgim qanı bilə etmişdür,
Ol şuxi-kamandar oxunun fağına bax.

Bəzm əhlini məstü naşəkiba eyləgən
Şol badə verən saqinin iqrağına bax.

Kəm eyləmədi mərhəmətni halimdin,
Xublar, şəhnin, Əmani, işfağına bax.

* * *

Olur insan xilaseyi-afaq,
Dəhri-zaliğə verə bilsə təlaq.

Mayil olğan bu halətə bardur
İki aləmdə mərziyül-əxlaq.

Rizq üçün dəm yemə, çü olmuşdur
Kafili-rizqi-qasimül-ərzaq.

Adəm oğluğa rəsmi-irsüdür,
Nəfsi nəhy olğana bola müştaq.

Cümlədən türfə bu ki, kəm irməs,
İttifaqən, aralarında nifaq.

Bolmamağa təəllüqatə həris
Adəm oğlunda yoxdur istehqaq.

Ayrulıq vəsfi andin olmuş kim,
Bilələr zövqi-vəslü rəngi-fəraq.

Əvvəlü axırın irür mə'lum,
Bolmaqil öz-özünğə çox əmraq.

Fariqül-bal, Əmani, olmuşduq,
Bolmasa ihtibasü istiğraq.

* * *

Tapubdur eyni-lütfündin əzəl gündə nəzər aşi
Əcəb yox qılsa ömrün tiğiğə köksün sipər aşiq.

Yüzün görgəc əgər tabü təvansız bolsa, tan irməs,
İrür mə’zur, cana, çün səni bihəd sevər aşiq.

Təşşüq aləmində hər nihali-nov səni görsə,
Qədin yadı bilə bixud əyağığa tüşər aşiq.

Yəqinü e’tiqadü sidq andaq eşqə yardur kim,
Qapundin tüşsə bir taş, yeriğə başın qoyər aşiq.

Etipdür tövfi-kuyin sərfi nəqd ömrini daim,
Degil çün andin özgə sərgüzərğə rahbər aşiq.

Məhal irür vüsalü arizu həm eyb iməs andin,
Cünuni-eşq birlə öz-özün hər dəm qucər aşiq.

Kəmali-eşq verməkdür riza canan rizəsiğə,
Bu adabi, Əmani, bilmədi aləmdə hər aşiq.

* * *

Bar ğəmi sərmayeyi-əsbabi-eşq,
Zikrü fikrü fatehül-əbvabi-eşq.

Etdi əmrazi-dü aləmdin xilas
Arifi-sadiqləri cüllabi-eşq.

Ey xoş ol bidar kim, leylü nəhar,
Girmədi hərgiz gözüngə xabi-eşq.

Aşiq olmağnı ğənimət bil, könül,
Hər kim irməs qabili-əlqabi-eşq.

Eşqdin mən’ etmə, ey naseh, məni –
Kim, bəsi könlüm irür bitabi-eşq.

Könül adlığ bir bəlalum bardı,
Uğradı tufanğa dər girdabi-eşq.

Zahir etgəc dərdi-dil Həllac dik,
Darə çəkdi cismimi qüllabi-eşq.

Bəzmi-ğəmdə saqiyi-hicr əlgidin,
Ey Əmani, nuş qıl xunabi-eşq.

* * *

Necə yar eyləsə bipərvalıq,
Olur əfzun könülə şeydalıq.

Ey səlah əhli, yolumdin savılın,
Ta tutaşmaya sizə rüsvalıq.

Bizni yad etməsə istiğnadin,
Eyb iməs, böylə olur mirzalıq.

Yüzü mənzuri-nəzər bolğanda
Sərvi könlüm göziğə binalıq.

Müşkbu mürrəsidin badi-səba
Yetirür nikhəti-ruhəfzalıq.

İstəsən kim, olasan məhrəmi-raz,
Zinhar, eyləmə sirrifşalıq.

Aqibət, bisərü saman etdi,
Ey Əmani, bizi bu xudralıq.

* * *

Səhiqəddim çü qılğac türrəsidin ənbərəfşanlıq
Nisarın qılmamaq can nəqdini irür pəşimanlıq.

Təbəssüm birlə siminğəbğəbüm çün ğönçəsin açdı,
Xəcalətdin bolub pəjmürdə, gül tərk etdi xəndanlıq.

Tülu etgəc cəmalinin quyaşi bədri-lame dik,
Haman dəm nəsx boldu nuri-mehrə lafi-tabanlıq.

Həvəsi-pabusin etmək biədəbliqdür, könül, bizgə,
İrür bu müğtənim kim, bar tamaşasında heyranlıq.

Vüsali-gülğə məğrur olma köp, ey bülbüli-şeyda,
İməs çün biş beş gündin bu əyyami-xoşəlhanlıq.

Nə hasil novbahar əyyamidin mən zari-bidilğə,
Çü cananumdin ayru boldu zindanım gülüstanlıq.

Əmani, tirgüzürür, öldürür, yox ixtiyarın kim,
Əzəldin natəvan canın bolupdur çünki cananlıq.

* * *

Bir quyaş heyraniyəm, manəndi yox,
Könlümün mehridin özgə fəndi yox.

Ğeyri-tari-cə'di-ənbərbardin
Can quşunun dəhr ara pabəndi yox.

Qane irür vaqe olqanğa könül,
Vəsl ilə hicranə çunü çəndi yox.

Şükr kim, dünyavü mafihasiğə,
Filhəqiqə, könlümün peyvəndi yox.

Ey Əmani, müğtənimdür dərdi-eşq,
Aqibət çün hiç işin xürsəndi yox.

* * *

Könül, bir ah ilən gər evin zirü zəbər qılsan,
Bu işdə minnətin çün bardurur, gər kargər qılsan.

Nə qamətdür bu, ya rəb kim, qiyamət qoparur eldin,
Xuraman sərv yanlığ hər tərəf, cana, güzər qılsan.

Nə nöqsan həşmətiğə, mahvəşlər şahı, gər min dik,
Gədayi-binəvağə lütf ilən bir yol nəzər qılsan?

Nola gər baxsan, ey xurşidvəş, bu zərrə yanlığğa,
Yüzün tabidin ol dəm biqərarü bixəbər qılsan?

Nola, ya rəb, əgər sən bir baxış birlə Əmani dik
Dili-avarəni, cana, ğənim avarəvər qılsan?

* * *

Ey rahəti-ruh olan vüsalın,
Peyvəstə könüldədür xəyalın.

Bərrəğmi-sipəhri-duni-bədkiş,
Ya rəb, bola kim, görəm cəmalın?

Hüsn əhli təmam bolsalar cəm,
Eynimğə görünməyə misalın.

Görüm ki, müdam kam tapgil,
Heç növ ilə bolmasun məlalın.

Min zarni saldı, ey dili-zar,
Ğövğayi-fərağə qilü qalın.

Bitablığımı, ey səba, ərz
Qıl yarıma, tüşsə gər məcalın.

Məzkur elə dərdi-intizarım
Ol növ ki, bardurur xisalın.

Ümidim bar kim, edə tə'sir
Əhvalıma eyləgən sualın.

Şayəd ki, nəzarəsiğə yetsəm,
Aytqay ki, nədir, Əmani, halın?

* * *

Bihəmdilləh, yenə gördüm cəmalın,
Müyəssər boldu əyyami-vüsalın.

Neçük şükrin deyim, bolsun kim,
Müyəssərdür cavab ilə sualın.

Həmişə xürrəmü payəndə olsun
Lətafət bağidə nazik nihalın.

Təsəvvür etmək olmas, çəkmiş ola
Əzəl nəqqaşi nəqşi-imtisalın.

Əmaniğə ənisi-məhrəmi-raz
Müin olmuş əzəl gündə xəyalın.

* * *

Ömr sərf olduvü tərk olmadı tuli-əməlin,
Nadim olmaqdur işin vəqti yetişgəc əcəlin.

İnziva küncünə qaçıb, başini qurtara gör,
Axirül-əmr dolaşur əyağə çün əməlin.

Bolma göz çəmxəliməğcə, könül, andin ğafil,
Bil yəqin kim, bu əməl mücməlidir münfəsəlin.

Aldadur nəfs səni hiyləvü təzvir bilə,
E'timad eyləməgil qövlünə hərgiz dəğəlin.

Qismətə qane olub bulgilən iradə müdam,
Yetməgən yergə həvəs aləmidin sunma əlin.

Hər necə oynayıban utmuş olasan fələgi,
Ğafil olma kim, alur nəqdi-həyatı şətəlin.

Feyz ədəbidin, Əmani, sana lütf oldu məgər,
Haləti-türfə bizə berdi yenə bu ğəzəlin.

* * *

Ey könül, yar xəyalın eləmiş mehmanın,
Varlığın eylə fəda, neçə ki, bar imkanın.

Yar bəzmidə əgər tapdum isə dövləti-qürb,
Bö'd iməs lütfü gəda birlə olur sultanın.

Sevdügüm, tabü təvansızlığımı tan sayma,
Çün əzəl gündin olubmin əbədi heyranın.

Öltürürmin deyübən bermə mana bim, ey şux,
Eydi-əzha irür ol gün kim, olam qurbanın.

Yox əcəb, gər məni mən' eyləsə naseh, cana,
Çün əyan irməs ona zövği-ğəmi-pünhanın.

Münddəi gördü çü kamicə kəmalın dəmidür,
Gər zəvaliğə anın nafiz ola fərmanın.

Xəl'əti-eşq, Əmani, çü nəsibin olmuş,
Ariyət xəl'ətidin əsrə təni-üryanın.

* * *

Könül, şad ol, ğəmi-eşqini ehsan etdi cananın,
Çü hasil oldu məqsəd, sürgilən kamınca dövranın.

Bolubmin, ey quyaş, mehrinğə heyran öylə kim, gözğə
Görümməs zərrəcə xurşidü mahi-çərxi-gərdanın.

Yürəkdə ğönçəsan qalğan girehlər açılur, cana,
Təbəssümlə təkəllüm başlasa lə'li-dürəfşanın.

Xəyalum bağını gər rəşki-firdovsi-bərin bilsəm,
Əcəb irməs ki, seyr eylər anı sərvi-xuramanın.

Nəzər göz ucidin halımğa salsan, til irür aciz
Ədayi-şükrdə bu növ əltafi-nümayanın.

Sənin dik bu cəhan bağidə gül açılmamış hərgiz,
Ni tan, gər hər tərəfdə sədhəzaran bolsa nalanın.

Əmani, saysa gər yar itləri silkiğə sən zari,
Əsər bərgəy səhərgəhlər çəkən ah ilə əfğanın.

* * *

Deмək olmas şərh birlə rif'ətin,
Zahirü batin görünməs təl'ətin.

Hiç nəstə sənsizin irməs, vəli
Küfr irür hər şey'i qılmaq nisbətin.

Gərçi ğayibsin qamu ənzardin,
Külli-əşya zahiridür hikmətin.

Valehü şeydavü heyran olğana
Bar müsavi duzəx ilə cənnətin.

İki aləmdə nə kim, bardur təmam
Bərhəm etsə bir nəzərdə heybətin.

Həddi yoxdur heç kimin dəm urmağa,
Bolsa zahir ülfətin ya külfətin.

Zərrədin ərzü səma yanında kəm,
Əqlə sığmaz karü bari-qüdrətin.

Ərzi-hal etmən təhəccüd vəqtidə,
Ruhpərvər haləti bar riqqətin.

Ey Əmani, xarü zari-eşqi-dust
Çün olubsin, bəs duruyor izzətin.

* * *

Ey nuri-həq, hüveyda əz həlqəhayi-zülfün,
Vəlleylü vəzzühadur mö'cüznümayi-zülfün.

Asilərin günahın bişək bağışlar iyzəd,
Alsan şəfaət üçün əlgə dü tayi-zülfün.

Ruhanilər dimağın hər dəm müəttər eylər,
E'cazi-ətri birləq qaliyyəsayi-zülfün.

Yadundin olmasa dil ğafil dəmi, ni tan kim,
Hər şey başidə bardur zövqi-həvayi-zülfün.

Şükri irür güvahim, bihəddürür günahim,
Yövmül-qür'ə pənahim yoxdur vərayi-zülfün.

Ümmidvar Əmani bolmuş, çü vird etipdür
Canda sənayi-mehrin, dildə duayi-zülfün.

* * *

Olmuş əzəldin; ey məh, dil mübtəlayi-zülfün,
Eyb etmə, bolsa bitab can həm bərayi-zülfün.

Azürdəxatir olman kim lütf bolğanundin
Könlüm irür qədimi cövrazmayi-zülfün.

İrməs əcəb füzun şövq olsa məhəbbət üçün,
Qüllablər bulupdur çün həlqəhayi-zülfün.

Abi-həyat bulmaq asan irür könülğə,
Zülmatə pey aparur çün aşinayi-zülfün.

Dövri-qəmərni dutsa gər halə dik, tan irməs,
Çün sayəsin quyaşğa salmış hümayi-zülfün.

Əqrəblər aşiyanı min yil gər olsa eynüm,
Təğyir tapmağaydur başdin həvayi-zülfün.

Məqsədğə yetmək olur çün eşq himmətidin,
Canım Əmani yanlığ boldu fədayi-zülfün.

* * *

Bolsam, əcəb yox, şeydayi-hüsnün,
Aləmni tutmuş ğövğayi-hüsnün.

Bəhr ilə bərri fərq etmək olmaz,
Mövc ursa nagəh dəryayi-hüsnün.

İnsanda mümkün irməs, çü yoxdur,
Xeyli-mələkdə həmtayi-hüsnün.

Mümkün degildür kilki-qəzadin
Əmsalə yetgəy tuğrayi-hüsnün.

Mehrü məhəbbət məxfi qalurdi,
Gər bolmasaydı ifşayi-hüsnün.

Canü könüldin səbrü qərarı
Bir-bir apardı əczayi-hüsnün.

Əlqissə, qıldum varlıqni, cana,
Misli-Əmani yəğmayi-hüsnün.

* * *

Rəhmi yox ol dilbəri-əyyarənin,
Tabü tavanı dili-sədparənin.

Mərhəmi cüz vəsl iməs, neyləyin,
Navəki-hicr uğraduğı yarənin.

Möhnətə qatlan, könüla, çünki səbr
Olmuş olur çarəsi biçarənin.

Gərçi bolubmin bəsi aşüftəhal
Fikridə ol türreyi-tərrarənin.

Bar həvəsim aqibətül-əmr olam
Küştəsi ol ğəmzeyi-xunxarənin.

Cani-həzin ləzzəti əfzun olur,
Dərdi çox olsa dili-avarənin.

Zarü vəfadarı Əmani sifət
Barmola bir şux sitəmkarənin?

* * *

Olmuşam ruzi-əzəldin, ey pəri, zarın sənin,
Tan iməs bixudluğum, gördükcə didarın sənin.

Nadirül-əsr oldu əhli-aləm içrə, sevdügüm,
Ləhceyi-göftar birlə qəddü rəftarın sənin.

Bar müsavi vəslü hicran ğalib irür çünki sövq
Dərdün ilə istəməs timar bimarın sənin.

Kamranlıq elğə daim bersə dövran, ey könül,
Şadman ol, çün ğəm oldu imdi ğəmxarın sənin.

Andin afətsiz iməs bir dəm bu dövri-ruzigar,
Fitnələrğə bais olmuş ikki əyyarın sənin.

Ariyətdür çün bəni-adəmğə hər halət ki, bar,
Səhl irür, ey dəhri-dun, iqbalü idbarın sənin.

Heyrətim bardur, Əmani kim, neçük səbr eyləmiş
Munca ğəm navəkləriğə cismi-əfkarın sənin.

* * *

Ey dil, bu cəhan fikriğə xoş bənd oldun,
Tuli-əmələ həmişə xürsənd oldun.

Sərf eyləyibən ömrünü latayilğə,
Pabəstə beqeydi-zənü fərzənd oldun.

Hər ləfzdə sidqü kizbi fərq eyləməyib,
İbram ilə iltizami-sövgənd oldun.

Əxlaqi-zəmimədin xəlayiq içrə
Yandurmaq üçün misali-ispənd oldun.

Əzbəs ki, xilafi-adət irdi rəvişin,
Düşmənü dustiğə nə zəhr və nə qənd oldun.

Təşxisi-yamanü yaxşıyı eyləməyib,
Biqeydliq ilə xəlqə rişxənd oldun.

Vəz'i, könüla, Əmani dik bilməytin,
Hər naqis olan şikəstə peyvənd oldun.

* * *

Yarsız bağrumni qan etdün, fələk,
Həmdəmim ahü fəğan etdün, fələk.

Göz yolidin əşk rudin axıtıp,
Dərdi-punhanım bəyan etdün, fələk.

Sineyi-çakimni yüz min fənd ilən
Navəki-hicrə nişan etdün, fələk.

Könlüm etip mübtəlayi-dərdü ğəm,
Aqibət bixanuman etdün, fələk.

Münfəil etip həyatımdin bəsi
Binəvavü natəvan etdün, fələk.

Bülbüli-fəsli-xəzan görgən kibi
Bizni lalü natəvan etdün, fələk.

Zülmü bidadi Əmani dik mana,
Ayta alman kim, ni tan etdün, fələk.

* * *

Xoşhal bol, ey dil, yenə canana irişdük,
Fərsudə bolan cism kibi canə irişdük.

Dərdü ğəmi-hicranə dəxi tab yox irdi,
Əlminnətülillah ki, dərmanə irişdük.

Ol bülbüli-dey zülmünü görgən kibi nagəh
İmdadi-bahar ilə gülüstanə irişdük.

Ğəvvas oluban dalduq əgər bəhri-sirişkə,
Əcr olmadı zaye, düri-ğəltanə irişdük.

İstəklərimiz cümləsi mövcud olacaqdur,
Çün bəzmgəhi-işrətə rindanə irişdük.

Can nəqdini isar edəlim gəlgil, Əmani,
Şəm'i-rüxi-cananə çü pərvanə irişdük.

* * *

Quyaşdin arizi-məhpeykərin yeg,
Məhi-novdin xəmi-əbrulərin yeg.

Dirəxşan lə'ldin, həm neyşəkərdin
Berəngü tə'mi-innabi-tərin yeg.

Həzaran mən kibi, ey gül, fədayi –
Şikənci-zülfi-sən dik dilbərin yeg.

Nəzər əhliğə feyzi-tutiyadin
Ğubari-rahi-xasani-dərin yeg.

Əmani, Kə'beyi-kuyin təvaf et,
Gər istərsən ki, bolğay cövhərin yeg.

* * *

Ay yüzün bədrü qaşın misli-hilal,
Qamətin nəxlidə bar həddi-kəmal.

Təl'ətin anı üçün etmişdi
Yusifi-saniyi həmçün timsal.

Badeyi-eşqin edibür, cana,
Ta əbəd sağərimiz malamal.

Ya pəb, ol dəm bola kim, hali-tili
Ərz edə halımı çün tüşsə məcal.

Aşiqin eşqi həqiqi bolcaq,
Bar müsavi ona hicr ilə vüsal.

Könlümün mürğünü seyd eylədilər,
Dam ilə danə bolub zülf ilə xal.

Ah kim, arizuyi-bihasil
Qamətümnin əlifin eylədi dal.

Yemənəm ğəm, çü ğəmin hər saət
Zar könlümğə deyər: keyfəl-hal?

Özlügün yar rizasiğə berib,
Bol, Əmani, qamudin fariqbal.

* * *

Ötdü ömrü yetdi həngami-əcəl,
Ah kim, tərk olmadı tuli-əməl.

Artuq-əksük olmağı bardur məhal,
Qismət olmuş hər ni kim, ruzi-əzəl.

Heyf kim, məşğul irür insan müdam
Dünyeyi-murdariğə manəndi-cə'l.

Bir nəfəs təxfif tapmas hirsü az
Bavücudi kim, əbəsdür mahəsəl.

Cümləyi fani bilib sevgil anı –
Kim, tapılmas zatiğə mislü bədəl.

Razı olmas bir kişiğə bersələr
Dünyanın mayə rifini filməsəl.

Türfə budur kim, qoyub getmək gərək
Zihəyat olmaqlığı tapğac xələl.

Bu cəhan şəhdiğə mayil bolmağil,
Bar əcəl dami məgəsqə çün əsəl.

Bermədi heç növ ilə bizgə aman,
Ey Əmani, bir nəfəs nəfsi-dəğəl.

* * *

İşrətkədəmiz dəf'i-məlalın yeridür, gəl,
Can istədügi bəzmi-vüsalın yeridür, gəl.

Məhfuz olub ətrafı rəqiblər nəzəridin,
Məhzuzluğa eyni-kəmalın yeridür, gəl.

Bu mənzərə tapıb şərəf övciğə müqabil,
Mənzuri-rüxi-mehrmisalın yeridür, gəl.

Əhvali-dili zarni, əğyardin, ayru,
Ərz etməgə canənə məcalın yeridür, gəl.

Ey arizuyi-canü dili-zari-Əmani,
Biqal olan vəcd ilə halın yeridür, gəl.

* * *

Ey xoş ol aşiq ki, canan içün eyləb can səbil,
Ğeyri-sevdayi-məhəbbət bilməz özgə qalü qil.

İxtiyaridar edərğə dövləti-didar üçün
Aləmi-təhqiqdə Mənsur dik yox bir dəlil.

Ta bolay tənbih tüğyan əhliğə bu dəhr ara,
Etdilər nabud əbabil əmrilə əshabi-fil.

Həbbəza ol leylətül-əsra ki, xətmül-ənbiya
Birlə o, ədna məqamın tapmamışdı Cəbrəil.

Bizzərurə çün iraq mənzil übur olmaq gərək,
Tuşə fikrin etmək olay bolmadin əzmi-rəhil.

Tut təvəkkəltü ələllahın təriqin, ey könül,
İki aləmdə irür bizgə çü ol neə’mül-vəkil.

Ariyət bilgil, Əmani, bu cəhan mayə’rifin,
Say müsavi, qismətin bolsa kəsirü gər qəlil.

* * *

Göz olğac şol quyaş birlə müqabil,
Olur çün zərrə bitabü təvan dil.

Xədəngi-ğəmzə peykanın suvarmış
Yürək qanindin ol bibak qatil.

Gözüm nuri irür kuyi ğubarı,
İlahi, olmasun ol nur zayil.

Bu dünya birlə mafihasin etməs
Müqabil daneyi-xəşxaşə kamil.

Əmani, tilsiz olma, halı ərz et,
Qayitmas çünki naümmid sayil.

* * *

Məlul bolmagil, ər sə'b ötər mədar, ey dil,
Qərardadə degil vəz'i-ruzigar, ey dil.

Bu bisəbat içrə hər murad üçün daim
Təvəkkül eyləgilən, çəkmə intizar, ey dil.

Ğürurdin eləgil ictinab kim, sən dik
Zəmanə gülşənidə ötdü səd həzar, ey dil.

Təriqi-fəqr dutub kəsri-şə'ni şə'n saygil –
Ki, bar bu şivə kəmal əhliğə şüar, ey dil.

Təəllüqat irür müstəar aləmdə,
Bəqayi-ömrğə çün yoxdur e'tibar, ey dil.

Şərabi-nabğə meyl etməmək irür övla
Çü nəş'əsiğə gər ümid iməs xumar, ey dil.

Vüsalü hicr demə, qane ol Əmani dik,
İrür çü məqsədi-əsli rizayi-yar, ey dil.

* * *

Vəqtdür, sultani-aləm, rəhm qıl.
Tanriçün, ey cani-aləm, rəhm qıl.

Sənsiz eylər hər zaman şeyda könül
Naləvü əfğani-aləm, rəhm qıl.

Ey pəripeykər, sirişkim seylidin
Qopmadin tufani-aləm, rəhm qıl.

İstəməsmin vəslsiz bir dəm olay
Ömrü din, dövrani-aləm, rəhm qıl.

Zərrəpərvəliğ yolidin mehr dik,
Ey şəhi-xuğani-aləm, rəhm qıl.

Xari-ğəmdin qurtarıb min zarini,
Ğönçeyi-bustani-aləm, rəhm qıl.

Firqətindin olmuşam, ey gül'üzar,
Bülbüli-nalani-aləm, rəhm qıl.

Min əsiringə əlarəğmi-ədu,
Ey məhi tabani-aləm, rəhm qıl.

Zar könlümni Əmani dik ğəmin
Etdin sərgərdani-aləm, rəhm qıl.

* * *

Düşürdü bağdin çün damənin gül,
Tərənnümni fəramuş etdi bülbül.

Savurmaqdin gülün övraqini yel
Tutub matəm, açıbdur saçı sünbül.

Gəlürsə başa, ey dil, eşq dərdi,
İməs anın əlacı cüz təhəmmül.

Və lakin aşiqi-şeydayə bardur
Bəsi müşkül təhəmmülgə təvəssül.

Tələbkari-səfayi-batil olsan,
Təvəccöh qıl beərkani-təvəkkül.

Yəqin bilgil çəkər axır nədamət,
Hər ol kim, sözigə qoymas qəvavül.

Məqami-güldə görmək xar, Əmani,
İrür bülbülğə saçmaq başiğə kül.

* * *

Əz əzəl silsileyi-zülfünə vabəstə könül
Çün irür ta beəbəd bolmaya varəstə könül.

Gözünü qiblənüma, qaşını mehrab qılıb,
Yüzünə qarşu durur taətə peyvəstə könül.

Ah kim, bəzmi-fələk saqisinin dövründə
Ğeyri-xunabi-cigər görmədi heç nəstə könül.

Bigüman göydürür əflak ilə əncümni təmam,
Ahi-suzanını gər çəkməsə ahəstə könül.

Yar bimehrü fələk kinəvərü bəxt zəbun,
Ey Əmani, söləgil kim, neləsün xəstə könül?

* * *

Ah kim, tüşdü bedərdü ğəmi-hicranə könül,
Əcəbüm bar ki, yetə bir daxi dərmanə könül.

Cəm edib cümlə pərişanlığı sevdayi bolur,
Dolaşur xəmbəxəmi-türreyi-piçanə könül.

Eyləmə vəsf köp, ey Xızr, bərabər qılmas
Lə’li-ləb ləzzətini çeşmeyi-heyvanə könül.

Hiç bilmən ki, sərəncamı ni bolğay axır,
Arı yox, vermiş özün kuçeyi-ürfanə könül.

Döndü büryanə yanub, dönmədi bir yanə murad,
Atəşi-hicrğə, ya rəb, necə bir yanə könül?

Sə’y hərçənd elədük xatirimiz rə’yincə,
Aşina olmadı heç növ ilə biganə könül.

Vaiza, same’i-və’z olmağını dut mə’zur,
Rağib irür çü bəsi məşrəbi-rindanə könül.

Ey Əmani, əcəbüm bar ki, necük səbr edər
Dəmbədəm sadir olan möhnətə mərdanə könül.

* * *

Uyqudin gözünü açıb gəl gör mana, qönçələbüm,
Yetişipdür çü bu həsrətlə səhərgəhqə şəbüm.

Şərəfi-vəsli tapıb hicrni gördüm mə'dum,
Əxtəri-talein irür bu tülu'i əcəbüm.

Halı izhar eləmək həzrətinə hacət iməs,
Çün bilürsən ki, nədür əslidə hüsni-tələbüm.

Nəş'əti-qürb etibdür bəni layə'qəlü məst,
Bö'd iməs eyləsə tüğyan yenə tərki-ədəbüm.

Məni-binamü nişanqa bu səadət bəs kim,
Pasibani-səgi-kuyin sölənibdür ləqəbüm.

İntiaş eyləsələr same' olanlar, ni əcəb,
Dəftəri-eşqdin olmuş bu ğəzəl müstəcəbüm.

Baş açıb yalın ayaq gəzməgüm irməs tan kim,
Oldu rüsvalığa çün eşq, Əmani, səbəbüm.

* * *

Qalmadı tabü təvanım sənsiz, ey arami-can,
Gəlməsən bilgil ki, tapmassin vücudimdin nişan.

Ömr məstə'cəl, fələk pürkinü sən biiltifat,
Yox əcəb, bir ah ilən can çıxsa təndin nagəhan.

Sən rəfiqlər söhbəti birlə tapıbsan kami-eyş,
Mən qalıbmin guşeyi-həsrətdə zarü natəvan.

Böylə piçü tabə kim, zülfün salupdur könlümü,
Mütəpəsil zari pərişan ruzigar olsam, ni tan.

Boldu möhnətğə mübəddəl rahətim hicr əlgidin,
Müşkül olur hal əgər vəsl olmasa rahətrəsan.

Vəsldin çün bizni məhrum istər ol şəm'i-murad,
Barı, ey can, başiğə pərvanə dik var bir dolan.

Yetirür ərşə, Əmani, xeyli-ğəm, bidadidin
Hər zaman yüz min fəğan birlə sədayi-ələman.

* * *

Etipdür bağrımı qan cövri-hicran,
Görüm kim, başə gəlsün dövri-hicran.

Könül, kim bilmədi qədri-vüsalin,
Cəzasın verdi axır tövri-hicran.

Necə bir zar könlümğə yetişgay
Dəmadəm möhnəti-filfövri-hicran.

Könül bitablıq qılsa, tan irməs,
Çü bilməs kim, neçükdür ğövri-hicran.

Bolay, ya rəb, Əmani edə nabud
Vüsali-şirsövlət sövri-hicran?

* * *

Eynüm yüzünə olalı heyran,
Əqlüm çaşub, olmuşam pərişan.

Lö'lö dişinə demək xətadur,
Lə'li-ləbinə həm abi-heyvan.

Ya rəb, gün irürmü ya tolun ay
Yüzün ki, ziyasın eylər ehsan?

Qaşü gözü xəttü xal birlə
Qıldın dilü könlümü şitaban.

Lazım məni-tilbəğə bolupdur
Leyl ilə nəhar ahü əfğan.

Yoxdur çü mənüm kibi diləfgar,
Yalğuzca qalan əsirü nalan.

Bu halətə xoşdiləm kim, irməs
Bitablığum yanında pünhan.

Yeksan elədi təəşşüqi-eşq
Yadınla könülğə vəslü hicran.

Gözümğə iki cəhan görünməs
Gərmi-nəzərin olanda, ey can.

Oldu səni görgəli Əmani
Avarə miyani-küfrü iman.

* * *

Müənbər kakilin qılma pərişan –
Ki, hər bir tarı bardur rişteyi-can.

Sin ol əyyarsin kim, fitnələrin
Gözü qaşındin edər dami-dövran.

Könül dərdinğə bolmuş öylə xürsənd,
Xəyal etməs nədür aləmdə dərman.

Xədəngi-ğəmzəni viran könüldin
Keçürdin, leyk zahir bolmadı qan.

Əmani mən kibi barmola, ya rəb,
Əsirü valehü şeydavü heyran?

* * *

Ey könül, çün heç kimə qılmaz vəfa axır cəhan,
Öylə san gördün mükərrər min bəhar ilən xəzan.

Arifə fərq eyləməz ömrün çoxu az olduğu,
Çün müyəssər bolmas insanğa həyati-cavidan.

Hatifi-lareybdin yetdi nida can guşiğə:
Məhmili-məqsud keçdi, yatma, ey qafil, oyan.

Çünki rəzzaq eyləmiş məqsum hər şey rizqini,
Minnəti-dunan neçün çəkmək gərək bəhri-dü nan?!

Bir səri-mu eyləmək bolmaz bəyani-şükrünü,
Hər səri-mu bolsa şükrün etməgə yüz min zəban.

Ömr anın yadı bilə sərf et, sağın əğyardin,
İstəsən kim, ikki aləmdə bolasın kamran.

Ey Əmani, yardin bir ləhzə ğafil bolmagil –
Kim, ötər ömrü yetər səngi-əcəl, bermək aman.

* * *

Şərhi-hicranğa yox imkani-bəyan,
Şadlıq bolmasa könlümdə, ni tan.

Öylə avarəvü səhrayi cünun
Olmuşam kim, tapaman əqlə nişan.

Hər nəfəs yad etibən vəsli barur
Huşdin bu dili-bitabü təvan.

Müşkül oldu bu dirilmək sənsiz
Məni-məhcurğə, ey rahəti-can.

Vəh ki, min zarni yüz həsrət ilə
Vadiyi-heyrətə saldı hicran.

Çərx salğunca cüda vəslündin,
Canım alğaydı mənim kaş rəvan.

Valehü bidilü nalan min dik
Barmola hiç bepeydavü nihan?

Dövləti-vəsl Əmani tapğay
Hicr rəğmiğə əcəl bersə aman.

* * *

Gəlgil, ey dərdi-dilə dərman edən,
Vəsli birlə müşkülüm asan edən.

Min əsiri-zarni pərvanə dik
Nuri-rüxsarınğa sərgərdan edən.

Bəhri-ğəmdə eşq ğəvvası üçün
Daneyi-əşkim düri-ğəltan edən.

Sünbülü nərgis bilə oldun, büta,
Canü dil aşüftəvü heyran edən.

Aqibət tapğay həyati-cavidan
Sidq ilə canın sana qurban edən.

Gülşəni-hüsniğə könlüm mürğini
Əndəlibi-valehi-nalan edən.

Dün gecə növhəm eşitgəc dedi kim:
Bu Əmanidür yenə əfğan edən.

* * *

Ol büti-əyyar ötdü ğəmzeyi-cadu ilən,
Saldı baxğac könlümə yüz növhə hayü huy ilən.

Bəs pərişan eylədi halını min aşüftənin
Sünbüli-pürçini-ətramizi-ənbərbu ilən.

Tərrəsi tarı kəməndi-mürği-ruh olsa, ni tan,
Yaxşılıq bolğac çəkərlər aləmi bir mu ilən.

Canda dərdü dildə ahü gözlə əşkü təndə zə’f,
Türfə halım bar, rəfiqa, munca ğəm-ğəyğu ilən.

Oldular mənsux aləmdə quyaş birlə hilal,
Mehri-rüxsarı tülu etgəc xəmi-əbru ilən.

Yetdi ərşə məcmə'i-taətdə qəd-qamət evi,
Sərvinazım zahir olğac qaməti-dilcu ilən.

Bibəlayi-eşq Əmani ola bilməs, ey rəfiq,
Sərf etibdür ömrü aləmdə bu yanlığ xu ilən.

* * *

Gəldi ol çapüksüvarəm naz ilən,
Can quşun seyd etməgə şəhbaz ilən.

Mən gəda halın təəqqül eyləniz,
Yetgəc ol sultani-hüsn e'zaz ilən.

Dinü dilnin afətidür ğəmzəsi,
Heç bilmən netgay ol ğəmmaz ilən.

Həq rizasiçün zəmani, mütriba,
Fariq etgil bizni ğəmdin saz ilən.

Kəsb elə aşiqliqi pərvanədin,
Sə'y edər can verməgə pərvaz ilən.

Aqibət sahibkəmali-bizəval
Eşq eylər aşiqi e'caz ilən.

Ey Əmani, xürrəm ol kim, keçürür
Ömrünün əyyamini həmraz ilən.

* * *

Ney kibi mö'tad olub fəryadə mən,
Ömr nəqdin verdüm axır badə mən.

Sərf etib övqatı latayil bilə,
Bir yarar iş qılmadum dünyadə mən.

Şükr kim, eşqindin oldum, ey pəri,
İki aləm fikridin azadə mən.

Der idin görgəc tökəm qanın sənin,
Tizrək bol, olmuşam amadə mən.

Sunma sağər, saqiya, şol ğəmzədin,
Məstü mədhuş olmuşam bibadə mən.

Olsalardı ögrədərdüm eşqinin
Halətin Məcnun ilə Fərhadə mən.

Ey Əmani, bir dəm olmaz şadman,
Neyləyim bu xatiri-naşadə mən?

* * *

Şəha, cahın həmişə bolsun əfzun,
Təxəyyüldin bürun, əz lütfi-biçün

Həmişə həqq-təala dərgəhində
Nə kim, məqsudun irür hasil olsun.

Mübarək xatirin rə'yincə, ya rəb,
Dolansun müttəsil bu çərxi-gərdun.

Qapuna sidq ilə hər kim ki, gəlsə,
Olur sirri-həqiqət ona məşhun.

Zi əksi-lə'li-gülgunun fələkdə
Məhi-nov haləti boldu digərgun.

Nəhibin rumilər bağrın etipdür
Üzari-kəşmirilər dik tolu xun.

Ədəscə himmətin yanında qədri
İməs gər bolsa yüz min gənci-Qarun.

Cəmalın mehriğə bar zərrələr dik,
Həzaran valehü şeydavü məftun.

Ğubari-astanındur Əmani,
Yəqin əhliğə rövşəndür bu məzmun.

* * *

Heç kişi aləmdə məhcur olmasun,
Dövləti-didardin dur olmasun.

Hər nə varid olsa şeyda aşiqə,
Səhl irür, tək hicrə rəncur olmasun.

Mehri-rüxsarindin özgə zərrəcə
Gözlərimğə, ey pəri, nur olmasun.

Sevdügü bidadidin aşiq fərəh
Tapmasa, aləmdə məsrur olmasun.

Mümkün irməs aşiqin rüsvalığın,
Desələr, aləmdə məşhur olmasun.

Qəsdi-azar eyləyipdür müddəi,
Ya rəb, ol haliğə məqdur olmasun.

İştahayi-kamil, olğac əks üçün,
Kasə bəs çiniyyi-fəğfur olmasun.

Qıl süluk öylə ki, bə’di-rehlətin
Ğeyri-zikri-xeyr məzkur olmasun.

Ey Əmani, sə’y qıl, azürdədil
Səndin heç vəch bir mur olmasun.

* * *

Sayən başımdin, ey şəhi-xuban, kəm olmasun,
Vəslindin ayru ömr mana bir dəm olmasun.

Saqiyi-dəhr sağəri ta kim, olur nəsib,
Eşqin meyidin özgə əbəd nəş’əm olmasun.

Ey tazə gül, nihali-qədi-nazpərvərin
Hərgiz zi tündbadi-həvadis xəm olmasun.

Peyvəstə kamranlıq ilə ömrü sərf edib,
Dəryayi-xatirində ğubari-ğəm olmasun.

Yadundin ayru olmas Əmani çü bir nəfəs,
Adını zikr ötdügidin əbsəm olmasun.

* * *

Vüsalın müjdəsi ol dil rübadin
Nüzuli-vəhydür guya səmadin.

Bihəmdilləh təəşşüq aləmidə
Tapıb rahət, xilas olduq inadin.

Vücudin yarnın mövcud görmək
İnayətdür zi fəzli-kibriyadin.

Ğərəz ğeyri-rizasin hasil etmək
İməs hər dəm niyaz ilə duadin.

Əmani, vəslə hicr olmaq mübəddəl
İrür lütfi-xuda bimüntəhadin.

* * *

Əltafi-bilaşümarlərdin
Qurtar bizi intizarlərdin.

Mir'ati-zəmirə görkəzüb yüz,
Pak eylə qamu ğubarlərdin.

Sevdayivü biqərar olupdur
Dil sünbüli-müşkbarlərdin.

Xoş eylədi arizin təravət
Ğarət qamu gül'üzarlərdin.

Məhzuz elə xargüsarlərni
Başınğa saçan nisarlərdin.

Açılmadı ğönçəsi könülnün
Heç növ ilə novbəharlərdin.

Gül dirgənə namülayim irməs,
Azar yetişsə xarlərdin.

* * *

Hicran tüni qıl həzər, rəfiqa,
Ahimdin uçan şərarlərdin.

Tufan başıma qopar dəmadəm
Bu dideyi-əşkbarlərdin.

Mən zarni fariğ etdi eşqin
Aləmdə bolan mədarlərdin.

Bir ləmhə ayılmasun Əmani
Şol nərgisi-pürxümarlərdin.

Bəzm içrə, dila, çü tapmadın yar,
Səbr ilə gözət kənarlərdin.

* * *

Aşiq olan hər gecə görsə cəfa yardin,
Qan yuda, dəm urmiyə dərd ilə timardin.

Eşqinin ətvardin özgəsini ummanız
Aşiqi-biçareyi-zari-giriftardin.

Allidə bədrin hilal görməgən etsün nəzər
Göz ucidin qaşiğə guşeyi-dəstardin.

Laləsitan eylədi damənü piramənim
Dəmbədəm axan yaşım dideyi-xunbardin.

Ahim odu gər şərər çəksə, kəvakib göyər,
Hazır olanlar, həzar eyləniz əhrardin.

İki cəhan içrə ol kimsəni azadə bil,
Fariğ ola xatiri rahətü azardin.

Vəsldə görmək tərəb, hicrdə çəkmək təəb,
İrməs, Əmani, əcəb valehi-didardin.

* * *

Lazim irür aləmi-idrakdin
Fərq eləmək pakini napakdin.

"Ya rəb, etgəy əxtəri-bəxtim tülu"
Hadisati-gərdişi-əflakdin?

Çünki tale süst irür, mümkün iməs
Kam tapmaq ol büti-çalakdin.

Pənbeyi-daği irür aşiqlərin
Lalələr kim, baş çıxarmış xakdin.

Bas qədəm müjganıma, irməs dürüşt,
Nərm olupdur dideyi-nəmnakdin.

Bolmasa taətdə tüz qəlbin, ni sud
Şanəvü təsbih ilə misvakdin?

Aqibət çün kim, qoyub getmək gərək,
Ey Əmani, ni asığ imsakdin?

* * *

Yad qılmaysın tərəhhüm dik könülnün adidin,
Necə fəryad etməyin bu şivənin bidadidin?

Ləfzi-bidad olmasun, cana, nigari-xatirin,
Ərzi-hal irdi ğərəz bu nöqtənin iradidin.

Gəlməsən, ey nuri-eynüm, bil yəqin kim, cism evin
Seyli-müjgan birlə xeyli-ğəm yıxar bünyadidin.

Sə'b iməs minbə'd bö'd əyyamı məhzun könlümə,
Qürb ümidin çünki tapdum nameyi-infadidin.

Mən'i-rüsvalıq müfid irməs mənim dik valehə,
Naseha, keçgil, rizayi-həqq üçün bu vadidin.

Bolmağil məğruri-qürb, ey müddəi, axır verür
Badə məzlum zalimi ahi-dili-naşadidin.

Ey Əmani, eşq ədibi görgəli şeydalığım,
Unutupdur haləti-Məcnun ilə Fərhadidin.

***

Tan irməs, gər qopsa tufan əşkimin təqtiridin,
Çün tüşüpmin yardin ayru fələk təqdiridin.

Nameyi-namərəsan qasidğə can olsun nisar –
Kintiaşi-təb' hasil eylədük niştəridin?

Şol nəvazişnamənin vəsfi neçük qılğay bəyan,
Tapdı rövşənlik gözüm hər sətrinin təhriridin.

Haləti-yəhyil-izami tapğaymin, gər bir səda
Yetsə can guşiğə guya lə'linin təqriridin.

Filməsəl, gər yetsə ərşə izzü cah ilən başın,
Ğafil olma, ey Əmani, çərxinin təzviridin.

***

Yetsə yüz min sitəm ər caniğə canan əlidin,
Nə gəlür aşiqi-dilxəstəyə nalan əlidin?

Ey könül, yar rizasini gözətmək övla
Olmuşuz çünki bu gün aləmə dəstan əlidin.

Şəhsüvarı kim, irür ərsədə top rə'yincə,
Ni əcəb, bir nəfəs ər düşməsə çövgan əlidin.

Gərçi bitablığı həddin aşurmış şövqüm,
Ətəgin çəkmə məni-bidili-heyran əlidin.

Ol gülün xariğə, ey bülbüli-şeyda, qatlan,
Yox çü həddin edəsin çaki-giriban əlidin.

Cə'dinin piçü xəmi etdi pərişan dərğəm,
Hiç bilmən netəy ol afəti-iman əlidin?

Ey Əmani, əbədüd-dəhr bu sağər bəs kim,
Eyləmiş saqiyi-baqi bizə ehsan əlidin.

* * *

Bixirədliqdür qədim əyyamidin
Mehr ummaq dəhri-nafərcamidin.

Mehri qəhr irür əzəldin dəhrnin,
Bu degil puşidə xasü amidin.

Əksük etməs bir nəfəs gərduni-dun
Cövri-gunagun dili-nakamidin.

Lilləhilhəmd etməs istilayi-eşq
Bizni fariğ küfr ilə islamidin.

Ey şərabi-nab içən, qılgil həzər
Əşki-xunaludi-dərd aşamidin.

Nistliğdür çün sərəncam, ey könül,
Keçmək olay şüğli-nəngü namidin.

Müstəme irməsmin, ey naseh, sana,
Tanrıçun keç bu əbəs ibramidin.

Eşqini dünyavü mafihasiğə
Berməs aşiq şəqqi-istifhamidin.

Necə pünhan olsun eldin halətüm,
Ey Əmani, tüşsə təştüm bamidin.

* * *

Cananını istəyən keçər canidin,
Barəstə olur ah ilə əfğanidin.

Bir zərrə görünməz göziğə ikki cəhan,
Bitab olıcaq mehri-dirəxşanidin.

Min zarini sərfərazü mümtaz etdi
Həngami-nəzər lütfi-nümayanidin.

Xublər qamu hazır olsala bolməslər
Mənzuri-nəzərğə hüsnün ayinidin.

Aşiqliqi pərvanədin ögrən ki, öpüş
Can berib alur şəm'i-şəbistanidin.

Aşiqlərə məhvi-həstliq şivə irür,
Kəsb eylə bu vəz'i eşq ərkanidin.

Aşiqlər ara sadiqi-kamil anı bil kim,
Döndərməyə yüz sevdügü fərmanidin.

Xoş haləti bar aşiqi-zarın ki, tapubdur
Sərmayeyi-eyşi ğəmi-pünhanidin.

Hərçənd, Əmani, desələr xəlq kinayə,
Əksilməyə heç arifin ürfanidin.

***

Həqq güvahimdür ki, yoxdur gül yüzün hicranidin
Hiç növ ilə könül xətti cahan bustanidin.

Sənsizin yüz min bəlağə mübtəla boldu könül,
Olmasın hərgiz cüda heç bəndəsi sultanidin.

Canımın cananəsi, vəslindin ayru bir gecə
Uyqu görməz gözlərim nalan könül əfğanidin.

Ya rəb, olğaymu müyəssər kim, xilas etgəy məni
Dövləti-vəslin, nigara, hicrinin zindanidin?

Dəhr ara avarəvü məhcurü zarü mübtəla
Bolmasun məhrum mən dik heç kişi cananidin.

Müşfiqa, ərbabi-məclisini məlul eylər, desəm
Şəmmə bu köngülümün dərdü ğəmi-pünhanidin.

Ey könül, ahü fəğanü dərdü ğəmdin incimə,
Bizgə bu iş qismət olmuş eşqinin ərkanidin.

Ey Əmani, möhnəti-hicranğə tapğay ittila'
Bu ğəzəlni oxuğan mən zarinin divanidin.

***

Ey xoş ol kim, eşq istilasidin,
Fariğ olmuş bu cəhan ğövğasidin.

Mümkün irməs kim, görə xüşyarlıq,
Məst bolğan eşqinin səhbasidin.

Can fəda ol şuxə kim, qılmas nigəh
Aşiqi-şeydayə istiğnasidin.

Valehin vəz'idin et halın qiyas,
Ni sorarsin mənzilü mə'vasidin?

Yar tə’siri-məhəbbətdin tanur
Bir nəzərdə aşiqi simasidin.

Ey gözüm nuru, könül mir’atini
Pak qıl vəsl ilə hicran pasidin.

İkki aləmni müəttər eylədi
Tari-muyin buyi-ruhəfzasidin.

Gər təəssüf çəkməməkni istəsən,
Qıl həzər, zinhar, sirrifşasidin.

Türfə halı bir Əmaninin ki, xəlq
Uyqu bilməs ahü vaveylasidin.

* * *

Bolaymu, ya rəb, ol gün kim, görəm cananə didarın,
Bekami-dil dərəm hər bir nəzər rüxsari gülzarın?

Edər izhar üşşaqinə e’cazi-Məsihayi,
Təkəllüm birlə etgəc dür fişan lə’li-göhərbarın.

Nihali-tazələrni bağban eyniğə xar eylər,
Əgər bağ içrə nagah qəddi zahir qılsa rəftarın.

Ğəmi-eşqin anınçın eyləmiş məxsus min zarə,
Bilür ruzi-əzəldin çün dili-şeydayi ğəmxarın.

Qiyamət qopacaqdur dilrübalıq qəsdiğə nagəh,
Əgər mə’mur qılsa ğəmzeyi-xunrizi-əyyarın.

Kəmali-eşqi hasil eyləgən aşiq, anı bil kim,
Yetişsə ağzığa can, eyləməs izhar əsrarın.

Əmani pirliqidə eşqi tərk etməsə tan irməs,
İrür mə’zur, təğyir edə bilməs çün kim, ətvarın.

* * *

Salmas ol şux mənim halıma qət'ən nəzərin,
Busaram hər gecə təqrib salıb rəhgüzərin.

Xəttinin cədvəlini yüzdə münəccim göricək
Qaldı heyran, unutub səfheyi-şəmsü qəmərin.

Görməgən bağrı qanın rövzəni-eynində rəvan,
Nə bilür kim, necədür ğəmzə qılıcı kəsərin.

Dili-bitabü təvan itdi səri-kuyində,
Bilməzəm kim, necə sormaq gərək anın xəbərin.

Böylə kim, hicr bəni zarü nizar etmişdür,
Əcəbüm var ki, görəm bir də vüsalın əsərin.

Eşq yolunda qoyar baş bəlakeş aşiq,
Sağınıb afiyəti-dünyəvü üqba xətərin.

Ey Əmani, necə yar eyləsə bipərvalıq,
Ğəm yemə, bir gür olur kim, gözədür dərbədərin.

* * *

Sən mənüm arizuyi-canımsın,
Məhvəşin ğəmzə cavidanımsın.

Ləbi-canbəxşü ləfzi-ruhəfza,
Baisi-ömrü zindəganımsın.

İşvəpərdazü nazəninməhtab
Nazikəndamü mumiyanımsın.

Necə eşqindin olmayın şeyda,
Nadirül-əsr dilistanımsın.

Tan iməs sənsiz ər olam bitab,
Rahəti-cismi-natəvanımsın.

İməs izhari-dərdi-dil hacət,
Çün bilürsin ğəmi-nihanımsın.

Fədaviyəm Əmani dik yoluna,
Sevgülü yari-mehribanımsın.

* * *

Eşqin ğəmü dərdi bilə çün xuy tutubmin,
Fikrini iki dünyənin andin unutubmin.

Mə’zur tutun, əhli-vərə məstliqimni,
Dürdi-meyi-eşqi çü əzəl gündə yutubmin.

Bö’d irməs əgər əhli-vəfa içrə təqərrüb
Tapsam, çü anın kuyi itiğə ögünübmin.

Əqranı təqərrübdə, tənəzzüldə üzümni,
Çün kim, görəməs, guşeyi-üzlətni tutubmin.

Cismi quruqan dəhr ara ol şəcərəm kim,
Ömrün keçürüb, ah otu birlə tutuşubmin.

İqbarına məğrur köp, ey müddəi, olma,
İdbar ilə sən dik neçə quşlar uçurubmin.

Kafidür, Əmani, mana, elm ilə əməldin
Bir hərf ki, eyni irür eşqin, oxuyubmin.

* * *

Qaşi yayığa peyvəstə anın qurban olayturmin,
Yüzi ayığa hər ləhzə baxıb, heyran bolayturmin.

Güli-rüxsarı bağİ-naz ara nazikdür andaq kim,
Bolur azürdə, gər anın sarı göz çıxalayturmin.

Xəyalın hicr ara göndərdi halım sormağa, dedim:
Bihəmdilləh ki, vəsl ümmidi zövqidin qolayturmin.

Qolayturmin dedim, lakin bilaşübhə bilürmin kim,
Yetişgəc vəsliğə soldum sevünməkdin öləytürmin.

Əmani, iştiyaqım xakbusi-astaniğə
Nə növ'idür ki, til birlə anı hərgiz söləytürmin.

* * *

Ol ki, əndamiğə hayil eyləmiş pirahənin,
Ya rəb, olğaymu ki, bir vəch ilə silkəy damənin?

Ta görəymin valehü məhcurü zarü mübtəla,
Ləhzei bakami-dil gülbərgidin rə'na tənin.

Hiç növ ilə bərabər eyləməs əhli-yəqin,
Gülxəni-toprağığa ikki cəhanın gülşənin.

Gərçi tən tufraq boldu, bar ümidim bergəy ol,
Yanı yımrılğan məzarım üzrə cövlan tövsənin.

Ey Əmani, qaməti-nəxlin çü gördü bağban,
Bağ ara tərk eylədi sevdayi-sərvü susənin.

* * *

Görə bilmən yarı əğyar ilə həmdəm, neyləyin?
Xirməni-ömrümni bərbad etdi bu ğəm, neyləyin?

Hər nəzər kim, ğeyr cananum sarı salur, mana,
Cansitan zəxmi irür, nayab mərhəm, neyləyin?

Yarın istiğnasidin, şövqümnün istilasidin
Bolmuşam, ey dustlər, rüsvayi-aləm, neyləyin?

Tövfi-kuyində fəğanım həddin ötər hər gecə,
Bu səbəbdin gündüz olğac şərmsarəm, neyləyin?

Ey Əmani, bir nəfəs canım iməs ğəmdin xilas,
Söylə kim, min mübtəlayi, könlü dərhəm neyləyin?

* * *

Hicr bidadiğə bilmən neyləyin,
Sud qılmas ahü şivən, neyləyin?

Məxvəşa, ruyindin ayru eynimə
Tirə boldu mehri-rövşən, neyləyin?

Sənsizin can zarü biaram olub,
Nəql edər əz hücreyi-tən, neyləyin?

Dustlər, əfğanım etmin mən kim,
Bolmas ansız hicrə tüşgən, neyləyin?

Bir nəzərdə qarəti-din eylədi
Ol büti-əyyari-pürfən, neyləyin?

Ey Əmani, axirül-əmr oldular
Xəsmi-canım dustü düşmən, neyləyin?

* * *

Bu nə mətləb, dilistandur bu,
Bu nə aşub, əqlü candur bu.

Bu nə müjgan ki, tiri-pərrandur,
Bu nə əbru ki, çün kəmandur bu.

Bu nə məhruy, mehrtəl'ətdür,
Bu nə dilcuy, nüqtədandur bu.

Bu nə lə'li-ləbü nə mərcandur,
Bu nə göftar, dürfəşandur bu.

Bu nə xalü, nə xətti-cadudur,
Bu nə nərgis, nə sünbülandur bu.

Bu nə rəftarü qəddü qamətdür,
Bu nə nazik, nə mumiyandur bu.

Bu nə aşiq bolan Əmanidür,
Bu nə bitabü natəvandur bu.

* * *

Könlüm eylər vəsli-canan arizu,
Öylə kim, fərsudə tən can arizu.

Ariz üzrə xətni eynüm görgəli,
Eyləməs gül birlə reyhan arizu.

Öylə istər göz yüzün kim, edələr
Zülmət əhli mahi-taban arizu.

Kəlbi birlə astanı bəstərim
Bolmağa bardur firavan arizu.

Təngdil əzbəs ki, barmin, yoxdurur
Xatirimdə ğeyri-əfğan arizu.

Gülşəni-halimğə bermən külxəni,
Andin etmən bağü bostan arizu.

Təl'ətin görgəc şitaban zərrəliğ
Eyləməs mehri-dirəxşan arizu.

Zövqi-şövqidin Züleyxa dəmbədəm
Eylər idi tövfi-zindan arizu.

Ey Əmani, dərdə xürsənd ol müdam,
Qılmağil, zinhar, dərman arizu.

* * *

Könülnün macərasınmu deyin ya müddəasınmu?
Anı bitab qılğan bir mələksima ədasınmu?

Təxəyyül öz-özümlə dəmbədəm bilmən neçük qılğay,
Anın peyvəstə nazın ya könülnün ilticasınmu?

Vüsalın ehtiramiğə tapıbdur xoş şərəf aşiq,
Etib məhv arizusun, gözləmiş canan rizasınmu?

Şikayət birlə şükrün qaysı birin söyləyin, ya rəb,
Cəfasınmu rəqibin ya səgi-kuyi vəfasınmu?

Könül şadanü ğəmgin irməs iqbal olsa gər idbar,
Bilipdür bu cəhanın ibtidavü intihasınmu?

Ğəmim şərhini təhrir etməgə bilmən midad etgəy
Cigər xunabəsınmu ya iki eynüm qərasınmu?

Görənlər ol büti-əyyar kuyində məni derlər:
Əmani eyləmiş təbdil zünnarə ridasınmu?

* * *

Barmola, ya rəb, mənim dik pürgünah,
Naməsi üsyan ilən bolğan siyah?

Şərmsarəm nəfsi-şumin fe'lidin,
Sud qılmas hiç fəryad ilən ah.

Nəfsi-şumin zülmiğə bar hər nəfəs
Naləvü fəryadü əfğanım güvah.

Nəfsi-şeytan kamı birlə mən kibi
Bolmasın heç kimsənin halı təbah.

Ey Əmani, ğəm yemə, ümmidvar
Bol ki, həqq əltafı bardur üzrxah.

* * *

Quyaşum tale olğac nazəniliq şərqidin nagəh
Mana bitablıqdın zərrəvəş titrətmə tüşdü, vəh.

Cününum novbəhar əyyamı hər ay əvvəli tüğyan
Edər andin ki, bardurlar yüz ilə qaşığa əşbəh.

Dedim: cana, səni, ya Rəb, görəmmi eyni-zahirlə?
Dedi: yoxdur sana tabü nəzər var, olmagil əbləh.

Əcəb halət degilmi eşq ğövğası bu aləmdə,
Təəşşüq eyləgəc tüğyan, müsavidür gədavü şəh.

Neçük vəsfin etəy ol şuxinin kim, bir nigəh birlə
Apardı canü dilni öylə kim, hüsn olmadı agəh?

İrür ömri-dirazum riştəsi çün cə’di-mişkini,
Ümid oldur ki, eynüm görməgəy bir tarini kutəh.

Əgər mətlubə talibsən, yəqin bil ikki aləmdə
Dəlili eşq ədibi bolmağan bişəkk irür gümrəh.

Təfəkkürni şüar et dəhr ara, köp şad olub gülmə –
Ki, yetürgəy bəlalər başığa, kəbki-dirəng, qəh-qəh.

Səri-kuyində çün ayrıldılar canü könül məndin,
Vida edib dedilər: Ey Əmani, fi əmanilləh.

* * *

Məhəbbət riştəsin qılma güsəstə,
Vəfa tövrində çün irməs xücəstə.

Mənüm şeydalığım tan sayma, cana,
Qələm yoxdur çü aşiq birlə məstə.

Bihəmdilləh iməs ta ömrü bardur,
Kəməndi-zülfidin can mürğü cüstə.

Xuraman bağ seyridin gəlürsin,
Dərib əlvan çiçəklər dəstə-dəstə.

Ğəmi-eşq ilə qan yudmaqdin özgə
Ləziz irməs məzağə hiç nəstə.

Cəhan-cövridənü hicran ğəmidin
Mənim dik barmola xatirşikəstə?

Əmani yüziğə, cana, qədəm bas,
Qalubdur gözü yolda zarü xəstə.

* * *

Bibəhrə ol ki, qaldı zəlalət zəlalidə,
Ömrünü sərf etmədi canan xəyalidə.

Mətlubə talib olğana bar şərti-lazım,
Edə nisar canı xəyali-vüsalidə.

Billəh ki, hiç səfhə bəyazidə çəkməmiş
Nəqqaşi-sün’ nəqş cəmali misalidə.

Hər gəh təxəyyül eylərəm, artar təhəyyürüm
Təhriri-xəttü xalini rüxsari-alidə.

Görmüşmola zəmanə gözü naz bağidə
Nazik nihal qamətinin e’tidalidə.

İrür ümmidim ol ki, qəbul ola müddəa,
Halimni ərz eyləyə bilsəm məcalidə.

Rəşkim, Əmani, bardur ol azadəsalikə –
Kim, yox təəllüqi bu cəhan qilu qalidə.

* * *

Mə’şuqdin olmasa işarə,
Aşiq necə yetgəy iştiharə?

Batil zülımatü nuri etmiş
Zülfü yüzü leyl ilə nəharə.

Mə’ruz edər lisan halum
Dərdi-dilini həmişə yarə.

Ol ayını görməgə gözümğə
Hər gecə şümarədir sitarə.

Ğəmzə qılıcı edər dəmadəm
Qanlu cigərimni parə-parə.

Heyran olmuş dili-giriftar
Göz yüzigə qılğalı nəzarə.

Kuyində çü e’tibarsızlığ
Bəsdir məni-mübtəlayi-zarə.

Şeydalərü binəvalər içrə
İdbarını bermən iftixarə.

Cananı Əmani sarı gəlsə,
Can nəqdini sərf edər nisarə.

* * *

Adət edə arif ol şüarə –
Kim, nitq ola mərziyül-ibarə.

Dünyayə gələnğə olay oldur,
Qövğasidin eyləyə kənarə.

Meyl etmə meyə, iməs kəramət
Keyfiyyəti haləti-xumarə.

Məcnun der idi ki, aqil oldur
Sayılmış ola bizim qətarə.

Aləm ğəmini etibdürür zəbt,
Bardur əcəbüm-dili-figarə.

Peyvəstə tərəddüd etmə, zinhar,
Nəfsin tələbiğə misli-farə.

Bir dərdğə uğradur səni kim,
Tapılmas ona cahanda çarə.

Heç növ ilə etmə xatirini
Aludə beşiveyi-niqarə.

Əşğalını tərk elə, Əmani,
Dünya dəgəməz bu karü barə.

* * *

Nəsima, söylə ol məhru nigarə,
Bəni avarə qıldı varə-varə.

Tökər qanumni axır qəmzə birlə
Yazuqsız, cürmsiz ol mahparə.

Ni tan, gər bolmasa könlümdə aram,
Tapılmas dərdə çün aləmdə çarə.

Həzaran mən kibi mur olsa pamal,
Ğəm irməs şol Süleyman iqtidarə.

İnani-ixtiyarum getdi əldin,
Müqabil bolğac ol çapüksüvarə.

Qamaşub gözlərim, bitab olurmin,
Yüzü xurşidiğə qılğac nəzarə.

Nisarə can qəbul olsa, Əmani,
Bəsi minnət irür mən xaksarə.

* * *

Eşq ara rusvaylığ şöhrət irür şeydalərə,
Öylə kim, bar nazü istiğna pərisimalərə.

Aləmi bir daneyi-xaşxaşə oxşatmaqdurur
Nisbət etmək əşkimin tufanini dəryalərə.

Bir pərivəş həsrətidin, ey fələk, mən zarini
Vadiyi-heyrətdə saldın ahü vaveylalərə.

Ey könül, xudrə'yliqdin bizni mayil eylədin
Bu gülüstan içrə bülbül dik əcəb ğövğalərə.

İstəsən kim, yetməgəy hərgiz təəssüf xatirə,
Mayil olma, ey könül, bünyad olan mə'valərə.

Mənzili-əsli degil çün bu cəhani-bisəbat,
Halın izhar etməgil, zinhar, sirrifşalərə.

Ey Əmani, zilləti izzət sağın bu bağ ara,
Çünki şeyda əndədib oldun güli-rə'nalərə.

* * *

Hər kişinin tinəti kim, əsldin pak olmasa,
Büləcəb irməs, əgər ol sahibidrak olmasa.

Möhnəti-dami-bəladin olmasın hərgiz xilas,
Mürği-dil, cananiğə gər seydi-fitrak olmasa.

İki aləmdə dəvasız dərdə, ya rəb, uğrasın,
Bu könül gər yar cövridin fərəhnak olmasa.

Qane'vü xürsənd bolmas tame'i-dun cifədin,
Ta kim, axır gözləri qəbr içrə pürxak olmasa.

Tan iməs, qəllaş bolsa himmət əhli dəhr ara,
Mal cəm' olmaz, əgər zimnidə imsak olmasa.

Bolsa taətdə hüzuri-qəlb hasil, səhl irür
Şanəvü təhtül-hənək, təsbihü misvak olmasa.

Ey Əmani, budü nabudin müsavi saygilən,
Köksü tiği-eşqdin hər aşiqin çak olmasa.

* * *

Çün fədadur küfrü iman yarğə,
Sidq ilən vermək gərək can yarğə.

İstərəm hər dəmdə yüz min zövq ilə
Eyləgəy canumni qurban yarğə.

Xoş səadətdür bu kim, məxfi degil
Aşikara birlə pünhan yarğə.

Künd düşmən qılsa tüğyan, ğəm iməs,
Yetməs andin hiç nöqsan yarğə.

Ey Əmani, ya rəb, ol dəmni görəy,
Vasid olğay cani-nalan yarğə.

* * *

Ey xoş ol aşiq ki, qılğay can fəda cananiğə,
Eyləgəy bu rütbədin məhşərdə minnət caniğə.

Cismi-zarim gər nizar olmuşsa dərdi-eşqidin,
Şükrülliləh, hacətim yox əhli-tib dərmaniğə.

Bar qəbuli-xatirim, hərçənd bidad etsə yar,
Qarşulaşmaq bəndə həddi çün iməs soltaniğə.

Gəlsə başə hadisati-dəhrdin yüz min bəla,
Arif oldur yetməyə nöqsan anın ürfaniğə.

Münhədim bolğac təfavüt qoymaq olməs, bil yəqin,
Külbeyi-dərviş birlə mün’imin eyvaniğə.

Bu cahan bostanidin üzgil təmə, çün yox səbat
Ni güli-xəndaniğə, ni bülbüli-nalaniğə.

Əşk seyli birlə cismin hər tərəf xəs dik sürür,
Neyləsün heyran Əmani dideyi-giryaniğə?

* * *

Sevdügüm dərdi ki, yüz vəch ilə dərmanə dəgə,
İstərəm navəki-dilduzini kim, canə dəgə.

Ahimin atəşidin hicr tünü öylə şərar
Baş çəkmə kim, baridin sahəti-keyvanə dəgə.

Vəsl adabını pərvanədin ögrən, ey dil,
Zövq ilə can verə çün şəm'i-şəbistanə dəgə.

Ey pəri, eylə həzər, olmaya kim, badi-səhər
Tələbi-nəkhət üçün türreyi-piçanə dəgə.

Zahidi-zahirə məğrur necə bir, ya rəb,
Təfriqə qəsdi üçün məcmə'i-rindanə dəgə.

Başlər xaki-rəh olmuşdur ol ümmidğə kim,
Nagəhan bir gün ola məqdəmi-cananə dəgə.

Ey Əmani, verə can ölikə İsa dəli dik,
Lə'li çün vəqti-təkəllüm düri-ğəltanə dəgə.

* * *

Gözüm uğraşdı nagəh arizidə nöqteyi-xalə,
Könül mürğü həvayi-danə üçün düşdü dünbalə.

Dəmadəm bir nəzər birlə tökər mərdümlərin qanın,
İşarət qılsa canan ğəmzeyi-fəttani-qəttalə.

Tüşübdür başə sevdayi-xəmi-zülfün, əcəb irməs,
Pərişanlıq əgər zahir olursa hər dəm əqvalə.

İməs xoy arizi-gülrəngidə ol şux məhvəşnin,
Düşübdür lalə bərgi üzrə həngami-səhər jalə.

Qaşın qılıcı ğəmzən oxlaridin qalxani geydi
Elə kim, sərf olur əyyarının pəsmani rəmmalə.

Ni tan, gər bə’di-hicran kamran oldum vüsalidin,
Bəsi vaqe’ olubdur kim, yetər idbar iqbalə.

Satıb-alğan iki canibdin olğac razivü şakir,
Qərari-bey’ə irməs hacət ol saətdə dəllalə.

Bu gün novruzluq təqribidə öpdüm ayağını,
Yetişsin görəyim, ya rəb, anı çox mah ilən salə.

Əmani, ya rəb, olğaymu görəymin vəsl əyyamin,
Cigərni tiği-hicran qılmadin pərkalə-pərkalə.

* * *

Yetdük yenə dövləti-vüsalə,
Yüz şükr ətayi-zülcəlalə.

Til aciz irür bəyani-şükrə,
Sıqmazdı bu halət ehtimalə.

Təbdil fəraqi vəslə görmək
Yetməs idi heç kimə xəyalə.

Xoy qətrəsi arizində, cana,
Bənzər tüşə bərgi-gülğə jalə.

Hər nazü kirişmə ki, barındur,
Min zarğə eyləgil həvalə.

Pamali-qədin bolum ki, bolmuş
Məşhur nihali-e’tidalə.

Ğəm getdivü gəldü şadmanlığ,
Məhv oldu könüldin ahü nalə.

Qaşın gördüm, çü eydi-şami,
İrməs hacət, nəzər hilalə.

Xürsəndəm kim, iməs Əmani
Aludə bu bəzmi-qilü qalə.

* * *

İrür oli ki, təxfif ola, ey dil, bə’zi əf’alə,
Nədamət sud qılmas göz tüşicək səbti-ə’malə.

Keçibdür ömr, igidliqdin əsər peyda iməs, əmma
Könül qadir degil təğyir bergəy şəqqi-ətfalə.

Nə kim, qismət olursa əklü ləbs üçün ğənimət bil,
Müqəyyəd arif olmaz təlxü şirin, ətləsü şalə.

Pərişan ixtilatü hərzəgərd olmaz cəhan içrə,
Kəmalə yetməyə həmsöhbət olğan kimsə ər zalə.

Çü hasil olmadı ğeyri-füsusü xicləti-ə’mal,
Necə bir mayil olqaysin, könül, sövdayi-əbtalə:

Kəmalın kim, müqarin bar zəvalə öylə say anı,
Savırmış yelgə övrağın açılqac ğönçeyi-lalə.

Yəqinü sidqi-kamil talib olgil ikki aləmdə,
Əmani, müttəle’ mətlubin irür çün qamu halə.

* * *

Öpdüm ləbini xəyal birlə,
Zövqi-əbəd ittisal birlə.

Əfv eylədi cürmümü və lakin
Min qalmışam infial birlə.

Can mürğünə damü danə qılmış
Ariz üzə zülfü xal birlə.

Yüz canə digər, təkəllüm etsə,
Şol lə’li-dürər misal birlə.

Yüz canə dəgər, təkəllüm etsə,
Şol lə’li-dürər misal birlə.

Yüz səfhəsidə qaşın görən der:
Xoş bədr irür hilal birlə.

Mümkün irəməs vüsalə yetmək
Aşiqlərə qilü qal birlə.

Yar alidə halımı, nəsima,
Ərz eylə zəbani-hal birlə.

Canımnı nisar edəm xuraman
Görgəc qədin e'tidal birlə.

Amal neçük bolay, Əmani,
Tuli-əməlü vəbal birlə.

* * *

Cananə deyir qalmagilən canə bizimlə,
Bifaidədür söyləmək əfsanə bizimlə.

Xudrə'yliğin qoymadı heç növ ilə əldin,
Çün rast degil bu dili-divanə bizimlə.

Həm mö'təqidi-zahidü həm piri-müğanüz,
Ya rəb, ni qılay məşrəbi-rindanə bizimlə?

Vəslini könül birlə təxəyyül edəriz, leyk
Mümkün degil ol şux ola həmxanə bizimlə.

Görgəc səgi-kuyini təməllüq əcəb irməs,
Çün hər tün edər tövri-mühibbanə bizimlə.

Dil kami bilə köyməgə ol şəm' ğəmində,
Çalışmadı sübh olquca pərvanə bizimlə.

Mö'tad bolubdur, edəməz tərk, Əmani,
Fəttanlığı ol nərgisi-məstanə bizimlə.

* * *

Bilütf bolubdur yenə cananə bizimlə,
İrməs, əcəb, ər bolmasa həmxanə bizimlə.

Ya rəb, bola kim, çərxü fələk rəğmiğə ol şux
Dövranə sala sağərü peymanə bizimlə.

Mə’lum degil mehrü vəfa, cövrü cəfası,
Vermiş özünü küçeyi-ürfanə bizimlə.

Naz uyğusiğə mayil olub şol gözü fəttan,
Başlar gecələr bəzmdə əfsanə bizimlə.

Kuyi-itiğə tərhi-təməllüqni salıpdur,
Biganəliğ eylər dili-divanə bizimlə.

Allahı sevərsən ki, bekami-dili-əğyar,
Ey dust, danışma belə xəsmanə bizimlə.

Rüsvalığa axır ələm olduq çü, Əmani,
Gördün nelədi məşrəbi-rindanə bizimlə?

* * *

Kömkəç olay dünyadin əsbab ilə,
Yox vəfası çün şahü bəvvab ilə.

Mənbəi-eyni-inayətni tapan
Daim istiğna vurar mirab ilə.

Şüstüşuy səbti-üsyanımğa bəs
Rəhmətidin qətreyi-mizab ilə.

Zahidi-xudbin ki, bəs məhcub irür,
Qalacaqdur ta əbəd əhcab ilə.

Nəhv bilgənğə təfavüt eyləməs,
Xətti-ə’rab olmasa ə’rab ilə.

Əşki-eynüm xəs kibi cismim sürür,
Neyləyin bu tünd axan seylab ilə.

Zar könlümnün açılmas ğönçəsi
Bu cəhan bağı ara heç bab ilə.

Berməgil məhbubeyi-Təbrizə dil,
Bir qarıdur, zib edər sürxab ilə.

Ey Əmani, bar təəssüf şivəmiz,
Ömr çün sərf oldu xürdü xab ilə.

* * *

Gördüm ol yüzni yüz abü tab ilə,
Lə'li-sirabü düri-nayab ilə.

Görsədib göz mərdümiğə ruyi-dil,
Aldı könlümnü əcəb adab ilə.

Etgəli eynüm təvəccöh qaşığa
Meyli yoxdur canibi-mehrab ilə.

Muşikaf olğan xirəd yol tapmadı
Ağzının əsraridin heç bab ilə.

Eşqi adımnı Əmani qoyqalı
Bolmuşam məşhur bu əlqab ilə.

* * *

Astanın yastanım hüccab ilə,
Ta gözüm görgəy yüzün bir bab ilə.

Eşq bəhridə könül ğəvvas idi,
Kakilin seyd eylədi qüllab ilə.

Çün gözün cəlladının qurbaniyəm,
Ehtiyacım yoxdurur qəssab ilə.

İtlərin qürbünü tapsam bö’d iməs,
Ülfət irmişdür əcəb əhbab ilə.

Ey təbib, etmə əlaci-dərdi-eşq,
Bu mərəz tapmas dəva cüllab ilə.

İzdihami-eşqin istilasidin
Könlümün yox meyli şeybü şab ilə.

Çün Əmani bir qulundur nagüzir,
Eyləgil hökmün rəvan hər bab ilə.

* * *

Hasil olmas rö’yət ər canan ilə,
Yadidin xali degil dil can ilə.

Öylə müstəğni bolubmin dərdiğə,
Ehtiyacum yoxdurur dərman ilə.

Bülhəvəsliğ tərkin etgil, ey könül,
Kamə yetməs kimsə çün imkan ilə.

Sə’yi-batildür nəsibin bolmağan,
Dutmagil kin taleü dövran ilə.

Cəhd qılgil ta ki, bulğaysin müdam
Ahi-suzan, dideyi-giryan ilə.

Ey Əmani, etmə lafi-qürbi-dust,
Yox gədanın nisbəti sultan ilə.

* * *

Tan iməs, gər bolsa malamal eynim nəm bilə,
Bu təəssüfdü ki, keçdi nəqdi-ömrüm ğəm bilə.

Ehtimalı bar füzun bolğay sirişkim bigüman
Qılsalar səncidə mizani-nəzərdə yəm bilə.

İstərəm hər dəm büləndü pəsti-əfğan ilə ah
Cani-nalandin çəkəm ahəng zirü bəm bilə.

Eşqdin zinhar, ey dil, bolmagil bir dəm cüda –
Kim, dəlil oldur əzəldin aləmü adəm bilə.

Kuyi ehramidə çün tərki-əlayiq şərt irür,
İstəməsmin kim, bola ol dəmdə kölgəm həm bilə.

Tar ağızda əqd dəndanı irür nisbət ona –
Kim, tola vəqti-səhər gül ğönçəsi şəbnəm bilə.

Ey Əmani, ol pərivəş saldı yüz aşüftəliğ
Başiğə mən mübtəlanın türreyi-pürxəm bilə.

* * *

Dustgə mey sunsa saqi şəyfqəti-ami bilə,
Ayağığa baş qoyub çəkgil, könül, kami bilə.

Badeyi-vəsli xəyalilə məst etmiş məni –
Kim, müşəxxəs edə bilmən söhbəti şami bilə.

Ya rəb, andin yaxşı gün barmola şeyda aşiqə,
Fəsli-gül çəkəy səbuhini dilarami bilə?

Aqil irsən bu fənadə şeyb vəqti yetmədin,
Müğtənəm bil eşqini igitliq əyyami bilə.

Ey nəsihətgu, mənüm şeydalığım köp qılma mən’,
Nərgisü reyhanı gör rüxsari-gülfami bilə.

Müjdəsi can vermək irür, çün yetürgəy nagəhan
Nameyi-namini qasid vəsl peyğami bilə.

Ey Əmani, necə bolğay hal bilmən aqibət,
Boldu ənqa kimi napeyda könül nami bilə.

* * *

Ləhv ilə ləəbğə adət etmə,
Adat ğeyri-ibadət etmə.

Zinhar, cəhan mədarı üçün
Heç kimsə bilən inadət etmə.

Dərd əhlini daim eyləgil yad,
Tərki-rəvişi-əyadət etmə.

Bol aşiqi-sadiqin müridi,
Hər bülhəvəsə iradət etmə.

Hər gün kəm olur çü ömr, Əmani,
Tuli-əməlin ziyadət etmə.

* * *

İstəsən cananını, can istəmə,
Çəkgilən dərdini, dərman istəmə.

Dünyavü üqbadin oldur çün murad,
Anı istə, küfrü iman istəmə.

Aşiqa, gər e'tiqadın eşqə bar,
Sadiq olgil, vəslü hicran istəmə.

Çün xoşəlhanlıq iməs bülbül müdam,
Xarə xürsənd ol, gülüstan istəmə.

Ey səba, dağıtma müşkin sünbülün,
Əhli-aləmni pərişan istəmə.

Ey Əmani, zərrəcə azari-dil
Nisbəti-heyvanü insan istəmə.

* * *

Münqəte’ olmaq yetibdür nəfsi-təndin canimə,
Tanriçün əhvalımı ərz et, səba, cananimə.

Ya rəb, ol saət görəy kim, çərx rəğmiğə bolay
Kövkəbi-bəxtim müqarin ol məhi-tabanimə.

Guşeyi-möhnətdə ansız türfə halım bardurur,
Mane olma, ey nəsihətgu, dəmi əfğanimə.

Etə bilmən öznü riqqətdin, rəfiqa, hiç zəbt,
Neyləyin mən zar, ya rəb, dideyi-giryanimə.

Ey Əmani, əndəlib dik ol güli-rə’na yüz ot
Saldı hicran hirqətidin bu dili-nalənimə.

* * *

Fürsət olsa, sölə, ey badi-səba, cananə,
Sənsiz ol bidilü məhcur yetibdür canə.

Aqibət vadiyi-həsrətdə ğəmi-hicrandin
Oldu sövdayi könül şiftəvü divanə.

Rahətü möhnəti-aləm könülə yeksandur,
Vəsl əyyamı mübəddəl çün olur hicranə.

Eşq rüsvalığını tərk edə bilməz aşiq,
Naseha, pəndi unut, kutəh edib əfsanə.

Ey Əmani, nə həmin tilbə sən oldun, bolmuş
Eşq vadisidə divanə bəsi fərzanə.

* * *

Neyləyin, cananəsiz can natəvan oldu yenə,
Könlüm işi naləvü ahü fəğan oldu yenə.

Naşəkib olsam, ni tan kim, göz yolidin xuni-dil
Qətrə-qətrə cəm’ olub, seyli-rəvan oldu yenə.

Hiç bilməsmin neçük bolğay sərəncam, ey könül,
Böylə tirlik ansız ölməkdin yaman oldu yenə.

Derlər idi hicr ara bitablığ həddin ötər,
Bizgə bişəkk ol əlamət imtəhan oldu yenə.

Ah kim, canandin ayru dərdü ğəm ənqasiğə
İnziva küncündə könlüm aşiyan oldu yenə.

Bəzmi-vəslidin cüda ol şuxnin cismi-zəif
Navəki-dərdü bəlalərğə nişan oldu yenə.

Ey Əmani, mən əsirü zarü şeydayi netəy,
Yengidin xəlq içrə halım dastan oldu yenə.

* * *

Dəlü könlümni salub sövdayə,
Sünbülün sayə buraxmış ayə.

Zərrə yanlığ könülə mehri-rüxün
İkki aləmdə yetər sərmayə.

Atəşin lə'li-ləbin şövqidin
Tüşdü odlar təni-ğəmfərsayə.

Arizin əksi təravətni müdam
Edər ən'am güli-həmrayə.

Vərə'üm məhv edibən xatirdin
Saldı eşqin bəni xoş ğövğayə.

Neyləsün aşiqi-bisəbrü qərar
Belə xudrə'y bolan mirzayə.

Müğtənəm bilgil, Əmani, vəqti
Kim, bu gün zamin olur fərdayə?

* * *

Hərçənd cövr qılsan min zari-binavayə,
Şövqüm olur ziyadə, eşqim düşər bəlayə.

Bitablıq, ni tan kim, bardur könüldə, cana,
Hər tari-zülfün üçün sövdayi-binəhayə.

Filfövr xeyli-hicran nabud edər vücudum,
Gər dəmbədəm xəyalın yetişməsə hərayə.

Bidadın etmə əksük cani-bəlakeşümdin,
Şərti-təvəkkül ilə verdüm riza qəzayə.

Xurşidü mahü əncüm halimğə rəşk edüllər,
Hərgəh başimğa salsan, ey sərvi-naz, sayə.

Kəlbi-dərün sayıldum əhli-vəfa yanında,
Bu səltənət yetədür aləmdə min gədayə.

Ya Rəb, bolaymu ol dəm yüz zövq birlə etgəy
Canın fəda Əmani sin şuxi-dilrübayə.

* * *

Ey qaşın əhli-nəzər mehrabi,
Gözlərin qiblənüma əsbabi.

Ləm'eyi-mehri-rüxi-aləmtab
Birlə könlümdin alubsın tabi.

Saldı can qəsdiğə piçan zülfün
Hər şikən cövfiğə yüz qüllabi.

Etmək olmaz dəhənin sirrini vəsf,
Sığmaz əlfazə anın əlqabi.

Əşkə ğərq olma dedüm gözğə, dedi:
Sudan ayru düşəməz mürğabi.

Əcnəbidür çü əzəldin zahid,
Ta əbəd dərk edəməz adabi.

Dili-xudrə’yə, Əmani, ni deyim?
Etdi rüsva bəni istisvabi.

* * *

Barmola hicranə tüşkən mən kibi?
Dərdi-bidərmanə tüşgən mən kibi?

Yarsız heç kim cahanda bolmasun
Naləvü əfğanə tüşgən mən kibi.

Görməmişlər mərdüman göz əşkidin
Bəhri-bipayana tüşgən mən kibi.

Yoxdurur canənəsi hicranidə
Atəşi-suzanə tüşgən mən kibi.

Ey Əmani, müttəsil bitab olur
Məşrəbi-rindanə tüşgən mən kibi.

* * *

Arifin məqbuli-həqdür məzhəbi,
Çün xilafi-adət irməs məşrəbi.

Zahidi-xudbin, ni tan, məhcub isə,
Çün iməs adabdan ol əcnəbi.

Ahü fəryadimğə, naseh, etmə mən’,
Böylə keçər aşiqin ruzü şəbi.

Keçdi ömrü etmədi hərgiz tülu’
Bir gecə rə’yimcə bəxtim kövkəbi.

Neyləyin kim, boldu dinüm afəti
Bir büti-məhruyi-simin ğəbğəsi.

Ğəmzəsi könlüm quşun seyd eyləgəc,
“Olsun av qanlu” – dedi lə’li-ləbi.

Ey Əmani, hər kim olsa zari-eşq,
Əksük olmaz təndə zə’f ilən təbi.

* * *

Ah kim, saldı məni möhnətə canan, getdi,
Kami-vəsl almamış ikən yenə hicran yetdi.

Nasəbur eyləyibən saldı bəla vadisiğə,
Gördün, ey dil ki, bizə gərdişi-dövran netdi?

Ahü fəryad ki, bu taleyi-nafərmanum
Axırul-əmr məni bisərü saman etdi.

Çünki bərbad olunur, aqibətül-əmr qamu,
Dəhr bağidə, ni hasil, gülü reyhan bitdi.

Necə bir ğəm çəkəli ariyəti dünyadə,
Ey Əmani, elə saygil ki, tapılğan itdi.

* * *

Şad ol, könüla ki, yar gəldi,
Ğəm getdivü ğəmküsar gəldi.

Məhv oldu fəraqü vəsl yetdi,
Gül bitdivü sədhəzar gəldi.

Ahəng tərənnüm eylə, bülbül,
Dey rəğmiğə novbəhar gəldi.

Qalmadı könüldə xar-xarum,
Çün sövgülü gül'üzar gəldi.

Getmişdi qərar canü dildin,
Canan ilə biqərar gəldi.

İzhari-ğəm etməgil, Əmani,
Çün xatiriğə ğubar gəldi.

* * *

Ah kim, arami-canım gəlmədi,
Ötdü ömrü dilsitanım gəlmədi.

Edə bilmən heç kimə izhari-dərd,
Məhrəmi-razi nihanım gəlmədi.

Təlxkam olsam, əcəb yox, ey rəfiq,
Nuşləb mö'cüzlisanım gəlmədi.

Zə'fdin nali-qələm boldu tənim,
Nazı çox nazikmiyanım gəlmədi.

Ni əcəb, eynimğə olsa tirə mehr,
Mahmənzər mehribanım gəlmədi.

Olsa bihiss, tan iməs, daim məşam,
Türrəsi ənbərfəşanım gəlmədi.

Guy dik bipavü sər olsam, ni tan,
Dilbəri-çapükinanım gəlmədi.

Sərvnazindin, ni sud, ey bağban,
Bağ ara nəxli-rəvanım gəlmədi.

Ey Əmani, canı bermək səhl idi,
Neyləyin kim, canqıyanım gəlmədi.

* * *

Bihəmdilləh ki, canan vəslidin dil kamyab oldu,
Məlamətlər bolub dəf'ü dualar müstəcab oldu.

Mənəm, ya rəb ki, bəzmidə tapıb yar ol pərivəş dik,
Bekami-dil müyəssər hər sual ilən cavab oldu.

Güli-rüxsari rəngü buyidin zə'f eyləgəc könlüm,
O dəmdə dəf'i-zə'f üçün gözüm əşki gülab oldu.

Mana bəsdür bu dövlət dünyəvü üqbadə, ey müşfiq,
Ki, canım istəgi ol dilbəri-alicənab oldu.

Əgərçi səgritib çapüksüvarım keçdi, şadəm kim,
Sirişkim qanı birlə tövsəni sümmi xizab oldu.

Əcəb irməs könül gər aləm aralığ həvəs qılsa,
Cəmalı mehridin hər zərrə çün bir afitab oldu.

Yetişmişdi kəhalət vəqti, lakin vəsli-canandin
Ədu rəğmiğə yengidin yenə dövri-şəbab oldu.

Liqası eyləgən zahir vüsalın nəş'əsi bolmuş
Və gər ki, sanmağil kim, gözlərimğə meyli-xab oldu.

Belə divanəvü şeyda Əmani olmamış tənha,
Bəsi fərzanələr eşq içrə dil püriztirab oldu.

* * *

Kim ki pabəstey-namus oldu,
Dəhr zindanidə məhbus oldu.

Hər nə kim, istədi aləmdə könül,
Tapmadı, axırı mə'yus oldu.

Zarü üryan tənimə gərdi-fəna
Ədəm iqlimidə məlbus oldu.

Bivəfadur bu cəhan, eylə sağın,
Hər qulun çün Keyü Kavus oldu.

Ey Əmani, bu cahan mülkündə
Ömrümüz hasili əfsus oldu.

* * *

Eşq otinin asari göydürdü dili-zari,
Can vəsl giriftari, tən zə'f tələbkari.

Huşü xirədim aldı, yüz dərd-ğəmə saldi,
Ümmidim ona qaldı, kim iylədi gülnari?!

Bixab olub hər şəb ta sübh sayam kövkəb,
Kim çəkmiş ola, ya rəb, bu haləti-düşvari.

Çün ğönçə dili-xudrə'y qan toldu, yenə yüz vay,
Hicri-dili-canfərsay saldı məni ya xari?

Ğəm çəkməkdin, naseh, mən' etmə Əmanini,
Çün aşiqi zarundur eşqin ğəmi, ğəmxari.

* * *

Sərəfraz eylədin bu xaksəri,
Elə kim, əbri-rəhmət səbzəzari.

Dilü candin beğayət ğarət etmim
Vüsalın zövqü səbr ilə qərari.

Tülun-mahtab üçün çəkərdim
Dəmadəm dün gecə çox intizari.

Nümayan biniqab oldu quyaşım,
Zəmirim tapdı ğəmdin rəstkari.

Bu halətdin misali-zərrə bitab
Olub, nəqdi-rəvan qıldım nisari.

Hər ol kim, bar giriftari-ğəmi-eşq,
İrür əqranı içrə iftixari.

Əmani bolsa şeydayi tan irməs,
Alupdur eşq əlindin ixtiyari.

* * *

Görmədük rahəti aləmdə inadin ğeyri,
Yox şəfa bu mərəzə lütfi-xudadin ğeyri.

Nəzəri-mərhəməti istəmədi aşiqi-zar
Ğəmzeyi-fitnəkari-işvənümadin ğeyri.

Ərzi-hüsn etməgə cəm' eyləsələr xubləri,
Eynimə gəlməyə ol hurliqadin ğeyri.

Həbbəza saliki-kamil kim, ona rətbi-lisan
Olmiyə bə'di-dua mədhü sənadin ğeyri.

Zahidi-zahirə məğrur ki, əcəb irür işi,
Bilməmiş tövri riyazətni riyadin ğeyri.

Şami-hicran ğəminin şərhini peyğam aparan
Yoxdurur vəqti-səhər badi-səbadin ğeyri.

Səgi-kuyiğə təməllüqni Əmani qılsa,
Tan iməs, görməmiş andin çü vəfadin ğeyri.

* * *

İrür çün ariyət ömrün libasi,
Təəllüqlərinin olma mübtəlasi.

Həyatın ləzzətiğə bolma məğrur,
Fənağə çün qərin bardur bəqasi.

Xoş ol rəhrov ki, heç olmaz gilalud
Bu aləm seyridin kəfşü əsasi.

Ədəsdin kəm irür arif yanında
Cahanın ibtidadin intihasi.

Əcəb nərradsən, dəhra, həriflər,
Əlindin alamas heç növ’ tasi.

Sipəhri-dunğə aldanma, Əmani,
Çü bibünyad irür anın əsasi.

* * *

Neçük bolğay könülnün macərasi,
Bolupdur bir pərivəş mübtəlasi?

Ləbü ləfzi lətafət mizbani,
Gözü qaşi məlahət pişvasi.

Xətü xali misali-danəvü dam,
Qədü rəftari aləm dilrübasi.

Salupdur könlümü bir dərdə hicri –
Kim, anın ğeyri-vəsl irməs dəvasi.

Ni tan, ləfzin eşitgəc barsa huşum –
Ki, can almaq irür lə’li ədasi.

Təvəttün kuyin etsəm mən’ qılmın –
Ki, rəşki-yüz irəm irür fəzasi.

Hərimi-vəsli-mə’şuqə tapar yol,
Gər olsa sidqi-aşiq rəhnüması.

Yəqin bil, görsə zahid ol sənəmni,
Bədəl zünnarə bolğaydur ridasi.

İki aləmdə yoxdur, ey Əmani,
Könülnün andin özgə müddəasi.

* * *

Görsəm yüzün, ey gözüm ziyasi,
Hasil ola məqsəd intihasi.

Azadə iki cəhan ğəmidin
Etdi bəni eşq macərasi.

Ömr olsa, yolunda sərf olay,
Yoxdur çü tirikligin bəqasi.

Məni-bidildin təbəssüm ilə
Can almaq irür ləbin ədasi.

Olmadı sənin rizandin özgə
Hər işdə Əmani müddəasi.

Çün qədri-vüsalı bilmədi dil,
Hicran çəkmək irür səzasi.

Rəyimcə dolanmadı bu dövran,
Bilmən ki, nədəndürür bəlasi.

* * *

Olmuşam ol məhvəşin aşiqi-biçarəsi,
Tan iməs olsam müdam bidilü avarəsi.

Can necə qurtarayım, vurdu könül mürğini
Navəki-müjgan ilə ğəmzeyi-xunxarəsi.

Xəncəri-bidadni bağrıma hər dəm urar,
Türfə bu kim, hiç gəh zahir iməs yarəsi.

Canü dil olsun fəda şol məhə kim, dəhr ara
Mehrğə berdi ziya ləm’eyi-rüxsarəsi.

Eşq bizi aqibət eylədi rüsvayi-xəlq,
Eyləmədük ehtiyat, bu imiş inkarəsi.

Vəslin, Əmani, tapub qədrini çün bilmədin,
Hicr odiğə göyməgi eylədi kəffarəsi.

* * *

Bir pərinin olmuşam divanəsi –
Kim, irür şeyda könül cananəsi.

Başığa tolqanmaqum irməs əcəb,
Şəm’ sərgərdanidür pərvanəsi.

Eylədi tarac huşü əqlimi
Bir nəzərdə nərgisi-məstanəsi.

Dürri-dürdin necə yudqaymin müdam,
Kaş tolğay ömrümün peymanəsi.

Can fəda qılmaq gərək ol saqiyə –
Kim, irür mətlubi-dil xümxanəsi.

Xoş səadət tapdı Məcnun eşqidin,
Hər məcalis nəqlidür əfsanəsi.

Ey Əmani, etdi rüsva könlümü,
Aqibət, bu məşrəbi-rindanəsi.

* * *

Hər kim istər kim, edə dünyadə pişəndişi,
Pişə qılsın özüğə aşiqivü dərvişi.

Kafirə küfrü müsəlmanə nəmazü mana eşq,
Hər kimin öz yanıda bardurur bir kişi.

Aşiqi rütbeyi-aliğə yetürür bişəkk,
Eşq şeydalığının möhnəti-pişapişi.

Rahətü möhnətə xürsənd bolub, şükr eylə,
Arif oldur ki, müsavi sana nüşü nişi.

İstəməz ğeyri-rizayi-dili-canan hərgiz,
Eşqdin bəsdür, Əmani, çü sana bixişi.

* * *

Ğənn bermiş sana çün qədri-ali.
Ğəm içrə qoyma mən aşüftəhali.

İrür izəd güvahim kim, könüldin,
İməs bir dəm xəyalın xeyli xali.

Zəhi şövkət, zəhi həşmət, zəhi cah,
Zəhi rif'ət ki, yox imkan vüsali.

İki səyyadi-xunrizin giriftar
Edər bir navək ilən yüz ğəzali.

Ni dil bardur, ni can, ni xanuman həm,
Nə iman kafəri-eşqin olali.

Bəsi zibandədür, cana, cəmalın,
Bulunmaz dəhr ara anın misali.

Yer üzrə gülni, sərvi etdi mənsux
Yanağın ali, qəddin e'tidali.

Görən bir yol yüzün ta ömrü bardur
Gəzər şeydavü məstü laübali.

Əmanini anınçun zarü bidil
Edibdür dəhr ara vəslin xəyali.

* * *

Çəkən canan yolunda dərdi-bipayan sınanmazmı?
Qəbuli-dərgah olub, rütbeyi-ali qazanmazmı?

Məni-bixanumanu natəvanın zə'fi-hicrandin
Təni nali-qələm dik bolğayın əğyar inanmazmı?

Əcəb irməs, əgər peyvəstə sərgərdaniyəm anın –
Ki, şəm'in dövriğə pərvanə yanınca dolanmazmı?

Qədü yüzü gözün sərvü gülü nərgisğə oxşatğan
Nümayan təl'ətin görgəc xəcalətdin utanmazmı?

Sirişkim qanını yüz sarı cananım rəvan görgəc
Dedi: cövlan dəmidə tupcağım sümmi boyanmazmı?

Əməl tulivü hirsi-nəfsü süyan qəddi xəm qılsa,
Ni tan, bolğac buğac bari giran axır uşanmazmı?

Əmani göydügi ənduhi-hicrandin tan irməs kim,
Yürəkdə odlu dərdi bolğan axır dəmdə yanmazmı?

* * *

Yüzün məhtabə bənzər, bənzəməzmi?
Tənin simabə bənzər, bənzəməzmi?

Gözün qiblənüma olub həmişə.
Qaşın mehrabə bənzər, bənzəməzmi?

Dəhanın içrə dəndanın, nigara,
Düri-nayaba bənzər, bənzəməzmi?

Şəfayi-dərdi-hicr üçün könülğə
Ləbin innabə bənzər, bənzəməzmi?

Məhəbbətni ziyad etməgə zülfün
Xəmi-qüllabə bənzər, bənzəməzmi?

Əmani köksidə tırnağ nişani
Açuq əbvabə bənzər, bənzəməzmi?

* * *

Əgər, ey səba, görər olsan ol qədi sərvimi, yüzi mahimi,
Nəzər etdigün kimi ər elə düri-əşkimi, təfi-ahimi.

Səri-kuyidin səfər etdügüm degil idi ixtiyarım ilə,
Bu qəziyyənin səbəbi qəza olub ünlədi səri-rahimi.

İrür, ey əcəl, diləgim sana berəsən aman ki, məni-gəda
Besəd arizu dilü can fəda etibən görüb rüxi-şahimi.

Ya rəb, ola şad olubən tapub şərəfi-vüsalını yarımın,
Yetürəm berəğmi-ğəmi-hicran kəfi-payinə rüxi-kahimi?

Əsəri həyatum, Əmaniya, ədəm olmadı ğəmi-hicrdin,
Şərəfi-vüsaliğə yeticək necə üzr edim bu günahimi?

* * *

Can ilə tüfeyli-yari-cani,
Eşq əhli içidə qoy nişani.

Can ilə könülğə yar mehrin,
Qıl mayeyi-eyşi-cavidani.

Çün bardurur ittihadi-batin
Səhl ola təkəllüfi-zəbani.

Ömr ötdüvü yetdi natəvanlıq,
Qalmadı ümidi-kamrani.

Əfsusü dəriğ, nəfs əlidin
Heç vəch ilə almadıq inani.

Müşkül ki, məqasid ola hasil,
Gər böylə keçərsə zindəgani.

Zinhar, könülnü andin özgə
Heç kimsəyə berməgil, Əmani.

* * *

Hərçənd bevəchi-ləntərani,
Yetməs sana kimsənin gümani.

Zahirdə nihanisən və lakin
Peyda sana cümlənin nihani.

Xoş dövlət idi kim, oldu mümtaz
Əsra gecəsidə ümməhani.

Baqisini bilhinən, yanında
Bir zərrə degil cəhani-fani.

Ol aşiqə eyş irür müsəlləm –
Kim, məhv edə nam ilə nişani.

Təqriri-sifatin eyləməkdə
Aciz qamu kimsənin lisani.

Bəsdür bizə bu şərəf kim, olmaz
Hüsnün gülü bərginin xəzani.

Qurbanın olan tapar bilaşəkk
Üqbadə həyati-cavidani.

Beytül-həzənin müşərrəf etsən,
Can nəqdin edər nisar Əmani.

* * *

Lilləhilhəmd ki, gördüm yenə canan umni,
Şükriğə bar səzavar verəm canumni.

Gərçi yüz dərd könül çəkmiş idi hicrandin,
Berdi həq lütf edibən vəsl ilə dərmanumni.

Dey görən əndəlib idüm ki, beümmidi-bəhar
Könlümün kamicə gördüm güli-xəndanumni.

Necə şükrün yetürüm kim, yenə gördüm rövşən
Məhi-tabanum ilə külbeyi-əhzanumni.

Ötsə, yar, huşluğum haləti həddin, ni əcəb,
Məsti-didar elədim dideyi-heyranumni.

İsməilini Verahimğə bağışladı demək,
Həq qəbul eylədi bidəğdəğə qurbanumni.

Ey Əmani, bu ğəzəl zövqü səfadin pürzib,
Ərbəə əşr ilə ləf eylədi divanumni.

* * *

Ey valiyi-kişvəri-məani,
Canbaz olani yolunda tani.

Mən zarğə sənsizin bolupdur
Aləmdə həram zindəgani.

Can bolmasa şadman tan irməs
Könlüm çün irür ğəm aşiyani.

Ğəvvasi-zəmanə görməyipdür
Eynüm kibi bəhri-dürfəşani.

Bilmən neləyin, gedipdür əldin
Gülgun sirişkimin inani.

Sənsən bu gün, ey məhi-yeganə,
Xurşidi-sipəhri-kamrani.

Hirman odivü təhəyyür ahi
Göydü dili-zari-natəvani.

Həddin çü ötüpdür intizarın,
Görsət yüzün, al bu nimcani.

Bir baxmağuna bərabər etməs
Dünya bilə üqbəni Əmani.

* * *

Ol pəri qıldı yenə şeyda məni,
Aləm içrə eylədi rüsva məni.

Aləmi bardur giriftarı anın,
Ni giriftar eylədi tənha məni.

Zülfü sevdası başımğa tüşgəli,
Görməyipdür mənzilü mə’va məni.

Ah kim, bülbül sifət saldı yenə
Xari-hicrə ol güli-rə'na məni.

Həmnişinim hər kim oldu hicr ara,
Seylim əşki birlə doldu daməni.

Ey quyaş, yetgil kim, ağzın firqəti
Zərrə yanlığ etdi napeyda məni.

Ey Əmani, arizuyi-qəddi-yar
Çəng nisbət etdi xəm bala məni.

* * *

Atəşi-ah ilə göydü bu dili-şeyda məni,
Əhli-aləm içrə qıldı aqibət rüsva məni.

Aşinalıq əql ilə minbə'd qılmaq bar məhal,
Eyləmiş divanəsi çün ol pərisima məni.

Eşq istilasidin, cananın istiğnasidin
Etdi seyli-əşkimnin tüğyanı napeyda məni.

İxtiyar əldin alıb tabü təvansız eylədi.
İzdihami-şövqü suzi-ahü vaveyla məni.

Hər məcalis nəqli bolsa dastanim, ni əcəb,
Bülbüli-nalan etipdür ol güli-rə'na məni.

Bar hər bir tari-zülfidin könüldə yüz gireh,
Bilmənəm ki vəz'ə müncərr edə bu sövda məni.

Acizi-təqrir idim bir ləfz məzkur etməgə,
Eşq qıldı nəzm tərtibi üçün guya məni.

Şükrülilləh, bir nəfəs əyyami-əmr aşubi-eşq
Qoymadı şeydalıq ətvaridə biğovğa məni.

Ey Əmani, çün xuramanlıqda bihəmta irür,
Salsa, tar irməs, əyaqdin ol səhi bala məni.

* * *

İntizarım ötdü həddin, gəlmədi canan, netəy?
Qalmadı aram, hər dəm etməgəy əfğan, netəy?

Mən əsiri-piri-bimari-bəlakeş zarını
Eylədi tabü təvansız şiddəti-hicran, netəy?

Ol məsihadəm məni-bimarının baliniğə
Basmadı bir dəm qədəm, dərd oldu bidərman, netəy?

Ey bahari-hüsn, sənsiz novbəhar əyyamidə
Əbri-niysan dik irür bu dideyi-giryan, netəy?

Ey Əmani, gərm etib yekrani, cövlan eyləgəc
Şəhsüvarım, mən gədayi-bisərü saman netəy?

* * *

Dəhri-dun bidadidin, ya rəb, məni-heyran netəy?
Eyləyibdür vadiyi-heyrətdə sərgərdan, netəy?

Güllər övraqidə yoxdur zərrəcə buyi-vəfa,
Əndəlibi-zari-şeyda bolmayıb heyran, netəy?

Bir gəda kim, eyləmişdir künci-üzlətni məqam,
Mültəfit əhvaliğə gər bolmasa sultan, netəy?

Başaçuq, yalınəyağ gəzgən degildir halsız,
Şə’nini məhv eyləgənğə bolmasa ürfan, netəy?

Ey Əmani, arizu çox, e’tibarım ömrə yox,
Bir nəfəs rə’yimcə dönməz gərdişi-dövran, netəy?

* * *

Hicr bağrımni kəbab etdi, netəy?
Göz yaşım badeyi-nab etdi, netəy?

Can quşun dutmaq üçün ol əyyar
Tari-zülfünü tənab etdi, netəy?

Dustlar, dəhr bekami-düşmən
Məni-məhcurə itab etdi, netəy?

Ol büti-simbəri-səngindil
Xanumanumni xərab etdi, netəy?

Ey Əmani, dili-zarımğa fəraq
Bihədü həsr əzab etdi, netəy?

# Qəsidələr

* * *

Əslanı həqq-təalanın heydəri-Səfdər Əlidür.
Canişini Müstəfanın saqiyi-kövsər Əlidür.

Fatimənin taci-səri, Həsən, Hüseynin sərvəri,
Zeynəlibadin rəhbəri, şafe'i-məhşər Əlidür.

Baqirü Sadiqin şahi, Kazimü Rizanın mahi,
Təqivü Nəqi pənahi, hadivü rəhbər Əlidür.

Əsgərinin pişvayi, Sahibzəman müqtədayi,
Cinnü insin müddəayi, xaceyi-Qənbər Əlidür.

Mö'cüzat bəhrinə dalan, qalmışların əlin alan,
Azmışları yola salan, qatili-Əntər-Əlidür.

Dərmanı dərdi-nihanın, bəyanı elmi-Qur'anın,
Sultanı iki cəhanın, fatehi-Xeybər Əlidür.

Olan Kəb'ədə mövludi, tanın zati-mə'budi,
Fəqir Əmani məqsudi, sahibü sərvər Əlidür.

Bizi bu dinə yetürən, ğeyri aradan itürən,
Könül istəgin yetürən, qütbi-ərənlər Əlidür.

* * *

Şaha, mədədin saqiyi-kövsər olacaqdur,
Hər canibə əzm olsa müsəxxər olacaqdur.

Abbasi-Əlisən bu gün, ey şahi-cahangir,
İqliminə həd səddi-İskəndər olacaqdur.

Ğəm irməs, əgər xaricilər eyləsələr keyd,
Çün Mehdiyi-hadi sana rəhbər olacaqdur.

Fəthü zəfərü nüsrətü iqbal yanınca
Hükkami-cəhan cümləsi çakər olacaqdur.

Həq lütfü çü bar səltənətin rif'əti üçün
Ədna qapuci qəsrinə qeysər olacaqdur.

Əyyami-zühuri çü imamın yetişibdür,
İxfadə olanlar qamu əzhər olacaqdur.

Göz iyələrinə görünən vəz'i cəhanın
Aludəliyi məhv olub əzhər olacaqdur.

İsna əşəri xütbəsi minbərdə oxunub,
Rumü Ərəb iqlimi müsəxxər olacaqdur.

Çün Şah Səfinin çirağı yanmış əzəldin,
Rövşənlik ona ta dəmi-məhşər olacaqdur.

Sidq əhliğə təhqiq olubdur ki, əqalim
Təsxir tapub məzhəbi-Cə'fər olacaqdur.

Qazilər ilə Tanrı-təala kərəmidin
Şahə hərəmin tövfi müyəssər olacaqdur.

Hər məcmə' ara mülki-təvəllavü təbərra
Bərrəğmi-ədu bihədü bimərr olacaqdur.

Xurşid sifət şah tülu' eyləgəc ə'da
Əncüm kibi məhv olmağa müncərr olacaqdur.

Osmaninin onunu çü bir şahi sanarlar,
Osmani haçan şahə bərabər olacaqdur.

Təbriz fütuhatının əxbarı yetəndə,
İstanbulun əhli qamu müztərr olacaqdur.

Xotkar ğamu ğüssə bilə yaslara batub,
Matəmzədəvü zarü mükəddər olacaqdur.

Ol dəmdə qulağına yetər ğeybdin avaz:
Mülkün nə ki, bar şahə müqərrər olacaqdur.

Beş min başı osmanilərin böylə kəsilmək
Tənbihi-məsafi-qamu əsgər olacaqdur.

Paşaları dəstgir bolub düşməgəy əlgə,
Misli-məsəli-Əjdərü heydər olacaqdur.

Bu fəth ki, həq lütfü bilə boldu müyəssər,
İns ilə mələk şahə sənagər olacaqdur.

Ənva'i-rəayət ki, rəayağə şəhi-din
Etdi, əsəri ta dəmi-məhşər olacaqdur.

İsna əşərü əlfdə oldu bu fütuhat,
Tarixi cəhan əhliğə əşhər olacaqdur.

Din düşməniğə taclı qaxılar, Əmani,
Hər mə'rəkədə bolsa, müzəffər olacaqdur.

* * *

Təhmasib şəh, ol hadiyi-din, mürşidi-kamil –
Kim, şə'niğə həq paklığı eylədi nazil.

Fərz oldu duası mələkü insə ki, bardur
Həm seyyidi-alinəsəbü həm şəhi-adil.

Rövşən elədük dideyi-şükr zilli-ilahə,
Görməmiş idi kimsə bəni həzrətidin til.

Bar rütbəsi ol növ kim, istərlər olalar
Ərbabi-qüdüs qullarının silkiğə daxil.

Bir bəhr irür mədhü sənaye-şəhi-din kim,
Məllahi-təfəkkür ona heç bulmadı sahil.

Fərraşi-qəza hər gecə gög yüzidə zəncüm
Bu kövkəbə təzyini üçün tüzdü məşail.

Çox şükr, ələrəğmi-ədu həzrəti-iyzəd
Ərbabi-yəqin məqsədini eylədi hasil.

“Xurşid tülu” etgəc olur məhv kəvakib,
Hükkami-əqalim olamas şahə müqabil.

Əltafi-ilahi nə gör, ey arifi-sadiq,
Kəhli*-ğərəzə neylədi əndişeyi-batil.

Hər kim ki, müti’ oldu bu gün əmrinə şahin
Məhşər günidə yoxdur ona bimi-səlasil.

Məqsudi dügünün, könüla, hasil olur kim,
Qayıtmadı novmid bu dərgahdə sail.

Hər kimsədə bar zərrəcə büğzi-səgi-kuyi,
Əlbəttə, məzaqidə bolur zəhri-həlahil.

Ey dil, fələkin möhnətidin bolma hərasan,
Çün bəndəsi halidin iməs sahibi qafil.

Ğəm yemə, Əmani, şəhi-din öz kərəmidin
Min talibə hər dəmdə edər həlli-məsail.

* * *

Hadiyi-rahi-hüdasən, ya Əli.
Canişini-Müstəfasən, ya Əli.

İbni-əmmi-həzrəti-xeyrül-bəşər,
Həmsəri-Xeyrənnisasən, ya Əli.

Saqiyi-kövsər əmirəlmö’minin,
Sahibi-tacü livasən, ya Əli.

---

* Kəhli – ki əhli

Əvvəli-isna əşər, bə’di-nəbi,
Cinnü insə müqtədasən, ya Əli.

İltifati-kibriyadin şamili –
“Haləta”vü lafəta’sən, ya Əli.

Həqq-təalanın beğayət lütfidin
Dərdi-üsyanə şəfasən, ya Əli.

Dərgahinə yüz tutubdur xasü am,
Qibleyi-hacətrəvasən, ya Əli.

İki gün içrə vilayət əmridə
Mücmələn bimüntəhasən, ya Əli.

Berdin ərbabi-yəqin eyniğə nur,
Şəm’i-bəzmi-innəmasən, ya Əli.

Eylədin e’lal ədyan siğəsin,
Kamili-müşkülgüşasən, ya Əli.

Etmək olmaz zati-pakın vəsfini,
Nadiri-ərzü səmasən, ya Əli.

Mö’minü müfsidğə nuru nar üçün
Qasimi-yövmül-cəzasən, ya Əli.

Bimdin ümmidimiz irür füzun,
Çün şəf’i hər xətasən, ya Əli.

Çəkməzüz ğəm hadisati-dəhrdin,
Dafe’i-xeyli-bəlasən, ya Əli.

Etməmişlər qulların idraki-ğəm,
Baisi-zövqü səfasən, ya Əli.

Hacət irməs ərz qılmaq müddəa,
Çünki əsli-müddəasən, ya Əli.

Hasil edərsən Əmani məqsədin,
Mə’dəni-cudü səxasən, ya Əli.

* * *

Nəsli-xeyrül-mürsəlinsən, ya Səfi.
Müqtədayi-əhli-dinsən, ya Səfi.

Şər' adabidə əcdadın kimi,
Rəhnümayi-mö'mininsən, ya Səfi.

Həlqeyi-tövhidi pürnur eylədin,
Şəm'i-cəm'i-təyyibinsən, ya Səfi.

Çün məlayikdin ötüpdür mərtəbən,
Nazişi-ruhul-əminsən, ya Səfi.

Bar kəramatin bəsi həddin füzun,
Came'i-elmül-yəqinsən, ya Səfi.

Pürziya etdin könüllər kişvərin,
Mehri-bürci-övci-dinsən, ya Səfi.

Yüz tutupdur qapına ərbabi-sidq,
Qibleyi-əhli-yəqinsən, ya Səfi.

Nəfsü-şeytan şərrinin hifzi üçün,
Talibə hisni-həsinsən, ya Səfi.

Bar ümmidi günahindin füzun,
Çün Əmaniyə müinsən, ya Səfi.

* * *

Yenə əyyami-novbahar oldu,
Bülbülün nəğməsi həzar oldu.

İbtidayi-bəhar ətri-dimağ
Müşki-bidü bənəfşəzar oldu.

E'tidali-həva nəzakətidin
Cümlə əşcar pürsəmar oldu.

İntizari-bəhar bar irdi,
Şükr kim, rəf’i-intizar oldu.

Lilləhilhəmd əbri-himmətdin
Qətrələr səbzəğə nisar oldu.

Atəşin gül budaqidin tərəfeyn
Ğönçələr bərgi aşikar oldu.

Zeyli-əşcari-səbzəzar içrə
Cari hər sarı abşar oldu.

Rəşki-firdovs tazə güllərdin
Bağü rağ ilə kuhsar oldu.

Quşlar əlhanı hər səhərgəhdə
Cani-əfgarə ğəmküsar oldu.

Badeyi-vəhdətin şəmimin alan
Ta əbəd məsti-bixumar oldu.

Heçə dəgməz, könül, libasi-həyat,
Çün qamu xəlqə müstəar oldu.

Ahi-biixtiyar əgər çəksəm,
Əcəb irməs, çü tən nizar oldu.

Bolmağum biqərar tan sayman,
Yarə bilütfliğ şüar oldu.

Naşəkib köngülnün aşubi
Bir səhiqədd gül’üzar oldu.

Səbrü aram riştəsin üzdü,
Yüzdə cə’di çü tarumar oldu.

Tili mərcanü tişləri lö’lə,
Ləbləri lə’li-abdar oldu.

Nəxli-ümmidimə səmər bergən
Qəddi-mövzuni ol nigar oldu.

Ğəmzəsi vəz'ini neçük qılğay,
Hər baxışmağı fitnəbar oldu.

İzi toziğə yüz yetürməgümə
Əcəbim bar ki, bəxt yar oldu.

Tutiya əşkbar eynümğə
Astanındəki ğubar oldu.

İkki aləm səadətin tapdı,
Hər kimə lütfi-kirdigar oldu.

Aşiqi-mübtəlayə tən sanma,
Ahü əfğan əgər şiar oldu.

Etdi təsxiri-əqlü huş çü eşq,
Səbrü aram hərzəkar oldu.

Əql məhv olsa səhl irür, çün kim,
Eşq bunyadı üstüvar oldu.

Hadisati-zəmanədin daim
Eşq aşiqlərə hüzar oldu.

Neylərüz izzəti cəhan içrə,
Xarlıq çünki iftixar oldu.

Şöhrəti-eşqinin sərəfrazı
İki aləmdə namdar oldu.

Şadmanlığni neylərüz, çü könül
Ğəmi-eşq ilə kamgar oldu.

Məskənət bar mühal insanğa
Vəz'i-dövran çü bivüqar oldu.

Müddətül-ömr məskənü mə’luf
Valeh olğanğa kuyi-yar oldu.

Dəmbədəm intizari-məqdəmidin
Şeş cəhətğə gözüm çəhar oldu.

Baisi-tilbəliğ Əmaniğə
Şurişi-eşqü novbəhar oldu.

* * *

Ya ilahül-aləmin, səndən mədəd.
Ya kərimül-əkrəmin, səndən mədəd.

Rəhmətə möhtac olan dəmdə qamu,
Ya rəhimül-rahimin, səndən mədəd.

İstianət istəgəndə hər işə,
Ya müinül-müstəin, səndən mədəd.

Nüsrətü fəthi-cəhadi-din üçün,
Ya nəsirün-nasirin, səndən mədəd.

Rütbeyi-ə’layi-nəqdi tapmağa,
Ya ənisül-abidin, səndən mədəd.

Bolmağa tövfiqi-taati-rəfiq,
Ya vəliyyül-müttəqin, səndən mədəd.

Hifzi-imanü yəqinü sidq üçün
Ya həfizül-hafizin, səndən mədəd.

Həqqü batil fərqinin təşxisiğə,
Ya həkimül-hakimin, səndən mədəd.

İftitahi babi-ümmid olmaqa,
Ya fütuhül-fatehin, səndən mədəd.

Yarimizdin saxlamağa səm’imiz,
Ya səmi’üs-same’in, səndən mədəd.

Çün kim, işfaqın füzundur cümlədin,
Ya şəfiül-müşfiqin, səndən mədəd.

Aləmin şükrünü təqrir etməkə,
Ya şükurüş-şakirin, səndən mədəd.

Hurü qılmanın vüsalın tapmağa,
Ya cəmilül-əcməlin, səndən mədəd.

“Üzri-təqsirat üçün yövmül-füru”
Ya şəfi’ül-müznibin, səndən mədəd.

Məqsədi-dareyn hasil bolmağa,
Ya əmirül-mö’minin, səndən mədəd.

Eyləməgə kibri-nəfs ilən cəhad,
Ya qətilül-kafirin, səndən mədəd.

Rəf’i-keydi-şərri-şeytanı üçün,
Ya əcirül-müşrikin, səndən mədəd.

E’tisami-rişteyi-ümmidğə,
Ya zivacül-müttəsin, səndən mədəd.

Zahir olğac nameyi-ə’malımız,
Ya kiramül-katibin, səndən mədəd.

Məhv bolmaq xövf Əmani könlüdü,
Ya əmanül-xayifin, səndən mədəd.

# *Tərkibbənd və tərcibbəndlər*

* * *

Həddüm degil eyləmək təmənna,
Hüsni ciləvatini, fəəmma
Lütf eyləsə vahibül-ətaya
Eynüm benihanü aşikara
Mir'ati-xəyalidə təmaşa
Əksini edə bevəchi-ə'la.
Məzur dutun ki, lafi-bica
Urmaqları eşq edər təğaza.
Sərmayeyi-dünya birlə üqba
Aşiqlərə sidqdür, nə ğövğa.
Qət' eylə təəllüqi ki, mə'va
Lütf ola səmadə çün Məsiha.
Ta elmü əməl bərabər olmaz,
Bu atifələr müyəssər olmaz.

Heç kimsə işi cahanda itmam
Tapmas, əgər olsa xas əgər am.
Rə'yincə tolanmaz isə əyyam,
Səbr ilə gözət nolur sərəncam.
Eşq atəşi görməgən beəqsam,
Gər göysə min il irür hənuz xam.
Tövfi-hərəmiğə bağla ehram,
Ey dil ki, tapaysin aqibət kam.
Yüz şükr ki, bir üzari gülfam
Can mürğinə qurdu zülfdin dam.
İfham ola ğönçəsidin ibham,
Əyyam edə fitnə eynidin vam.
Aşiqlərə bizdin olsun e'lam,
Rüsvalığa təşti salduq əzbam.
Bu firqəyə təng imiş çü namus,

Salduq anı künci-həbsə mə’yus.
Çün ömrə əsasi-üstüvari
Yox, eşqə keçürgilən mədari.
Gər tüşsə mənim sarı güzari
Cananumın, ola can nisari.
Daim çəkərəm bu intizari,
Cismim ola kuyinin ğübari.
Ğəmdür könülün çü ğəmküsari,
Bilməz ki, nədür fərəh şüari.
Fəttan gözünün könül şikari
Ta olmadı, tapmadı qərari.
Eşq ilə gərək kim, iftixari
Fərq etməyə qürbü bö’di-yari.
Ya rəb, bizə leyl ilə nəhari
Məstanə keçir, nə bixumari.

Kim məhv ola həstliğ məqami
Layə’qəlü məst olağ müdami.
Divanəvü məstü labüali
Gəzmək çü degil cahanda xali,
Qoygil, könüla, əbəs xəyali,
Tərk eylə həvayi-mülkü mali.
Bu bəzmdə sədr ilə niali
Yeksan sayü çəkməgil məlali.
Ol kimini sevgilən, misali,
Tapılmasa, olmaya zəvali.
Gər istəyə hicr ya vüsali,
Ol qabilü qılma qilü qali.
Ərz etmək ona olamı hali,
Tapsaq, məsələn, əgər məcali?
Çox eyləmə, bağban, cidali,
Payəndə degil bağın nihali.

Çün sahibi beş gün eyləməs nəsb,
Bir yaxşı süluk eyləgil kəsb.
Peymanə dolanda, ey yeganə,

Baxmaz çü bəhar ilə xəzanə.
Mərdanə olan gərək cəhanə
Bel bağlamaya müxənnəsanə.
Öz halı bilə təvəkkülanə
Ğövğasidin eyləyə kəranə.
Bar minnəti möhnətin bu canə,
Müddətlər edibdür aşiyanə.
Ötgəc ğəmi-eşqdin fəsanə,
Ahum şərəri çəkər zəbanə.
Qan yaşumi eyləgəc rəvanə
Damanumə damə danə-danə.
Gər bolmasa nəğmeyi-çəğanə,
Əfğanumi bitəkəllüfanə.

Pərvaz qılım betərfi-ahəng,
Biminnəti-mütrib əz dili-təng.
Başumğə çü düşdü eşqdin zil,
Əmrazə verür şəfayi-acil.
Hər zərrəğə olsa lütfi şamil,
Xurşid ziyasin edə hasil.
Kəsb eylədilər qamu əfazil
Üşşaq nəvasidin məsayil.
Cananumı görsəm ər müqabil,
Aman olur üqdəhayi-müşkil.
Mənzuri-nəzər olandin, ey dil,
Göz çəmxəliməğcə olma ğafil.
Sərmayeyi-eyş saya aqil,
Eşqin ğəmi könlüm etsə mənzil.
Xoş dövlət irür ki, qılsa qatil
Məqtulləriğə bizni daxil.

Ta həşr günü olaq nümayan
Bu mərtəbə birlə beynəl-əqran.
Cananə yolunda canfəşanlıģ
Etgan yetə zövqi-zindəganlığ.
Bar eşqidə şərti-imtəhanlığ,

Cövrünü çək, eyləmə fəğanlığ.
Rüsvalığa yox çü hiç danlığ,
Ni qaldı daxi degəy nihanlığ.
Əyyamidin umma mehribanlığ,
Bir neçə gün olma kamranlığ.
Əfsusunu bizgə ərməğanlığ
Göndərdivü getdi novcəvanlığ.
Ol arizi görməgən zəmanlığ
Xar oldu gözümğə gülüstanlığ.
Eşqi ğəmi oldu çünki canlığ,
Şükrini əda etəy ni yanlığ.
Ya rəb, bu əsirü zar Əmani,
Avarəvü biqərar Əmani.

# Rübailər

Munis mana yox ğeyri-xəyalın, cana,
Ya rəb, bola kim, görəm cəmalın, cana,
Hicran sitəmi səzasidür könlümnün,
Çün bilmədi ol qədri-vüsalın, cana.

* * *

Əlminətülləh ki, Əmaniğə nəsib
Vəsl oldu bekami-dili-bisəbrü şəkib.
Hicr afətidin hadis olan ğəm getdi,
Bərrəğmi-rəqibid-duni-pürməkrü fərib.

* * *

Mən zari, Əmani, natəvan eylədi şeyb,
Mə’cubeyi-əbnayi-zəman eylədi şeyb.
Nakam bekami-düşmənan eylədi şeyb,
Əlqissə ki, binamü nişan eylədi şeyb.

* * *

Ey sərvi-xüramidə, çü oldun sərməst,
Sərməstliğin yetürdi tövbəmğə şikəst.
Başınçun əlimni kəsmə damanındin,
Zira ki, əyağidin tüşübən oldum pəst.

* * *

Həq sayəsi Abbas şahi-dinpərvər
Rumiğə şikəst berdi bafəthü zəfər.
On dört ilə min irdi ki, bu nüsrət üçün
Ğaşiyyəkeşi boldu qəza birlə qədər.

* * *

Sənsiz nəfəsi səbrü qərarım yoxdur,
Nəzzarədin özgə intizarım yoxdur.
Bitablıqımda ixtiyarım yoxdur,
Təşrif gətir ki, ğəmgüsarım yoxdur.

* * *

Hicran sitəmidin olmuşam zarü nizar,
Divanə könüldə qalmadı səbrü qərar.
Billah ki, dirilməkdin irür ölmək yeg,
Bu növ keçərsə müddəti-ömrə mədar.

* * *

Teyfur anın süluki-ətvari sürur
Yetgürdü bəsi könülğə həngami-hüzur.
Çün söhbət anınla fayizün-nur irür,
Xoşbəqt ol kim, vəslidin olmay məhcur.

* * *

Tiryakidə, eyb iməs, əgər ar olmaz,
Heç növ ilə çün təbiəti yar olmaz.
Gər fe'li müvafiq olmasa qövlü bilə,
Mə'zur dutun kim, anda iqrar olmaz.

* * *

Əfsus ki, yar getdi, qaldum bikəs,
Məhcurü əsir mən kibi heç kim iməs.
Könlümdə irür həsrəti-yüz növ həvəs,
Cüz nalə iməs daim işim misli-cərəs.

* * *

Heç kimsə cahanda kamran bolmas imiş –
Kim, axiri-ömr bağrı qan bolmas imiş.
Əhval bu yanlığ olduqiçün, ey dil,
Ariflərə meyli-xanuman bolmas imiş.

* * *

Ni lütf idi nagəhan ki, bünyad etdün,
Bir namə bilə Əmanidin yad etdün.
Hicr içrə pozuq könülnü abad etdün,
Əlqissə ki, ğəmdin anı azad etdün.

* * *

Hərçənd könülnü vəslə şadan etdük,
Gördük ki, zəmirini pərişan etdük.
Bol xoşluq ilən ki, xub hicran etdük,
Düşvər özümüzğə, sizgə asan etdük.

* * *

Saldı məni bir dərdə təhəmmül etmək –
Kim, olmaz onu hiç təəqqül etmək.
Cana, sana yetməgə özündin özgə
Bilmən dəxi kimsəni təvəssül etmək?

* * *

Yay ayı Mamanlıda olanlar hər yək,
Şatir sifət istidə vurarlar dütək.
Bu türfə ki, gecə-gündüz irür nəğərək,
Sazəndəvü rəqqasələri pəşşəvü kək.

* * *

Əhbab, gözümdin axılan qanı görün,
Hər dəmdə könül eyləgən əfğanı görün.
Ömr ötdüvü görmədük vüsalın əsərin,
Payansız olan möhnəti-hicranı görün.

* * *

Həq cadəsidin inhiraf eyləməgil,
Hər sözdə ki, bar laf gəzaf eyləməgil.
Gər bəndeyi-fərmanbərisən nəhy ilə əmr
Hökm olğana iqdamü xilaf eyləməgil.

* * *

Görmək yüzini ki, bihəd irür həvəsim,
Heç növ ilə neylə iməs dəstrəsim.
Qorxum bu ki, nagəh əcəl alğay nəfəsim,
Həsrət bilə könlümdə qalay mültəməsim.

* * *

Əfsus ki, ol vəhşi ğəzal olmadı ram,
Divanə könül vüsalidin tapmadı kam.
Hicran otunun hirqətidin eyşüm üçün
Bağır qanıdur kəbabü göz yaşı müdam.

* * *

Ey könlüm alan gözəl, giriftarın mən,
Ğarətzədeyi-dü çeşmi-əyyarın mən,
Şeydavü əsirü bidilü zarın mən,
Səndin nə nihan, valehi-didarın mən,

* * *

Dövran məni etgüncə cüda canandin,
Ey kaş, iraq salaydı cismim candin.
Görgən sitəmi dəlü könül hicrandin,
Nə şərh edim, ötüpdürür imkandin.

* * *

Həmmamidə çün lətafəti-əndamin
Göstərdi gözə, aldı könül aramin.
Əlqissə ki, bir nəzareyi-kamil üçün
Yəğmayə Əmani berdi nəngü namin.

* * *

Şaha, mədədin saqiyi-kövsər olsun,
Hükkami-cəhan cümləsi çakər olsun.
Əzm eylədügin tərəf müsəxxər olsun,
Tiğin ə'da başiğə əfsər olsun.

* * *

Durna teli sancıb başa gəlgəc canan,
Əqlüm quşunu uçurdu, qaldum heyran.
Ğarətğə berən huşunu min tilbə kimi
Barmola əsirü zarü bitabü təvan?

***

Qıldın çü səfər yarıçın Allah olsun,
Əhli-nəyərin himməti həmrah olsun.
Eyş ilə keçüb mədar, damanındin,
Dəsti-ğəmi-ruzigar kutah olsun.

***

Ya rəb, məni bisəbrü təhəmmül etmə,
Elgimdin iraq zeyi-təvəkkül etmə.
Hər əmrdə cüz Məhəmmədü alidin
Mən zarğə özgəni təvəssül etmə.

***

Yüz şükr ki, gəldük yenə kaşanəmizə,
Yetdük şərəfi-vüsali-cananəmizə.
Hərçənd qılursa naz ol fərzanə,
Minnətlər irür bu dili-divanəmizə.

***

Hərçənd ki, səndin olmişəm dur yenə,
Nakamü əsirü zarü məhcur yenə.
İyzəd kərəmiğə bar ümidüm, lakin
Vəslindin etəy könlünü məsrur yenə.

***

Hərçənd kim, olmadı fələk yar bizə,
Rahət yerinə yetirdi azar bizə.
Cövridin irür aman demək ar bizə,
Gen dünyanı gərçi eylədi dar bizə.

***

Hərçənd ki, yar bizni yad eyləmədi,
Ğəmdin edübən xilas, şad eyləmədi.
Lakin nəfəsi xüfyəvü izhardə dil,
Bidadidə heç növ ilə dad eyləmədi.

* * *

Ol dilbəri-şux naz ilən yetdi, netəy?
Şol ğəmzeyi-sehrbaz ilən yetdi, netəy?
Can mürğini seyd eyləmək üçün filfövr
Tupçaq minib, əldə baz ilən yetdi, netəy?

* * *

Kimdür ki, fələk köksünü çak eyləmədi,
Azürdəvü zarü dərdnak eyləmədi?
Mənzilgəhini tirə məğak eyləmədi,
Yüz həsrət ilən cismini xak eyləmədi?

* * *

Heyranın olub nərgisi-məstanın öpəy,
Qurbanın olub arizi-tabanın öpəy,
Lə'li-ləb ilən höqqeyi-mərcanın öpəy,
Həm ğəbğəbü həm sibi-zənəxdanın öpəy.

* * *

Rüxsareyi-ali-dilgüşa neçün öləy?
Şirin ləbi-lə'li-canfəza neçün öləy?
Zülfeyni-siyahi-müşksa neçün öləy?
Sən ta beqədəm təmami-ca neçün öləy?

* * *

Başimğə bəlayi-nagəhan yetdi, netəy?
Avarə bekmi-düşmənin etdi, netəy?
Təskinü qərarü huşü canü dilü, din,
Əqlü xirəd ilə cümləsi getdi, netəy?

* * *

Əlminnətülilləh, yenə canan gəldi,
Hicranğə şikəstü vəslə tüğyan gəldi,
Dərdi-dili-nalanimə dərman gəldi,
Fərsudə bolan cism eviğə can gəldi.

* * *

Əlminnətülilləh ki, vüsal əyyami
Zahir boluban oldu könül arami.
Til aciz irür bu şükrdin kim, berdi
Hicranğa mənim kamim ilə ilzami.

* * *

Bir gecə Süleymanlıda qış əyyami,
Vaqe' olucaq buraələri, əndami
Zəxm eylədilər, məhv elədük arami,
Əlqissə kim, ol gecə besəd nakami.

* * *

Tiryak yeyən necə kəsər tiryaki,
Təndin bədəl etməs çü müdər tiryaki,
Vəznin birinə bir arturub hər dəmdə
Əvvəldin axır olur betər tiryaki.

* * *

Ol kimsə ki, yemənəm deyər tiryaki,
Meyl edə əgər zialəmi-bibaki.
Nəf'i oldur ki, məsx olub ta beəbəd,
Bilkülliyə zayil edip idraki.

* * *

Əfsus ki, əyyami-cavanlıq getdi,
Ğəm ləşkəri gəldi, şadmanlıq getdi.
Bilkülliyə zə'fü natəvanlıq yetübən
Sərmayeyi-eyşü kamranlıq getdi.

* * *

Əfsus ki, nəfs şərmsar etdi bəni,
Üsyan yükü birlə ziri-bar etdi bəni,
Bisəbrü sükunü zarü xar etdi bəni,
Əlqissə ki, müstövcəbi-nar etdi bəni.

# Qitə və təkbeytlər

*

Bil yəqin kim, qəribin aləmdə
Əgnini bit yeyərü malını it.
Ğibtəsizliq ədəmindin oluri
Zə'fəran qiymətiğə sərf şibit.

*

Mehmanı əziz gör, mö'min,
Filməsəl gərçi bolsa ol kafir.
"Əkrəmüz-zeyfə" mucibi birlə
Ne'mətü xidmətin edər vafir.

*

Rəhmət səhabi dik qamu əhbabi-firqiğə
Olmuş pənah sayeyi-ali təbarinüz.
Bu atifət ümidiğə tapubdurur şərəf
Qürbi-civari-dövlətiğə xaksarinüz.

*

Bir-iki kimsə üçün el və günü
Bir-birə salmaq iməs heç layiq.
Hər kimi gözlə, şəha, qədrincə,
Ta qamu xəlqə bolaysin fayiq.

*

Türfə halətdür sipahi olmağımız, ey könül,
Almayandin alaruz və berməyənğə verürüz.
Xudhesab olub təəmmül edəlim insaf ilə,
Dinü iman bu əməl birlə necə olsun tənüz.

*

Əgər şəmmə'i söyləsəm haldin,
Olur xatiri-şadmanın həzin.
Həmən beh ki, dəm urmayıb, müttəsil
Çəkəm dəhr ara dərdü ğəm möhnətin.

*

Ərəbə türk eyləyüb ehsan,
Söylədi kim, yeməzmisən ayran?
Öz dilicə dedi ki, "vahidni"
Yeyə bilmən, neçük yeyim ayran?

*

Əkinin hasilin artırmaq üçün
Böyücək bağla bulağın gölünü.
Yılxıya səlləm elə ayğırını,
İstəsən kim, götürəsən dölünü.

* * *

Eşq rəşkidin edərlər daim
Canü dil bir-birə ənva'i-niza'.

Xirəd istər ki, nəsayih beribən,
Aralarında edə şərti-müşa'.

Qamusiğə berəcəkdür ilzam,
Şövqünün hökmü irür çünki müta'.

Nisbəti-şeybü şəbab olmaq üçün
Yel xəzan bərgin edər deyğə riqa.

Eşq adabini hər kim bilməs,
Bar təmiz əhli yanında çü siba'.

Mübtəlalıq ğəmiğə səbr qılan
Bardurur əsreyi-həccadə şüca'.

İxtiyar eyləgilən xövfü rica,
Namüşəxxəsdür, Əmani, övza'.

* * *

Lütfün üşşaqə pənah olduğu dəmdür ərəsat,
Naümid olmaya heç kimsə zi alidərəcat.
Hər nə kim, mümkün irür, fani olur, ya sane',
Səndin özgiğə səzavar degil zatü sifat.

* * *

Şadivü ğəm bərabər irür zar könlümə,
Çün bu fənadə hər kişi beş gün qonaq olur.

Qane' xəyalə bolğana hiç fərq eyləməs
Qismət vüsal dövlətivü ya fəraq olur.

Bərəks imiş cahanda bu məşhur olan məsəl:
"Gözdin iraq olanı könüldin iraq olur".

Andin ki, bən də mö'təkifi-kuyin olmuşam,
Ey dost, rö'yətin gözə az ittifaq olur.

Bermiş Əmani yar rizasiğə ixtiyar,
Öz rə'yin istəmək çü əbəs təmtəraq olur.

* * *

Ləfzi-e'cazı bilə yaqut ləbidin qüvvəti-ruh
Versə, tan irməs, olur çün ğönçeyi-gülnar nar.

Ğəm biyabanidə hicran atəşi cismim göyüb
Girdbad etsə, gəlür andi, sədayi-"Yar, Yar".

Ey müğənni, bu məqam içrə nəva üşşaqdin,
Bolmaya kim, tabqanun gərdişi-dəvvardar.

Eşq yolunda bilür Mənsuri-həllacı dəlil,
İztiyar etmək gərəkdür valehi-didardar.

Təb'imin mövzunluğu məxfi bolaydı kaş ki,
Ey Əmani, çün olupdur söyləmək əş'ar ar.

* * *

Məni-xəstənin pürsişi-haliğə
Səbükruhliq şivəsidin qədəm.

Basıb Xızr ta beytül-əhzan ara,
Müşərrəf bolanda zi təxti-dijəm.

Bolaymadım ol vəqt hazır və leyk
Təəssüfdin imdi həzaran ələm.

Həzin xatirimdin Əmani sifət
İməs heç növ ilə bir ləhzə kəm.

Məgər şamili-hali-zarum yenə
Bolay iltifatın zirahi-kərəm.

Bedəstur olay ki, qutulğayın
Əlarəğmi-gərdun zizindani-ğəm?

* * *

Yüz şükr, mübarək oldu məskən,
Gördüm yüzünü bevəchi-əhsən.

Fərsudə tənimğə yengidin can
Ehsan etdi xudayi-sübhan.

Mənsubeyi-ğeyb etdi imdad –
Kim, hicri-Əmani oldu bərbad.

* * *

Əgər can almaq isə müddəasi,
Fədasi hasil olsun dik rizasi.

Həvəs məhbubi-dünya vəslin etmə,
Vəfasın görməmiş heç aşinasi.

Əmani bilmədi çün qədri-vəslin,
Fəraq otiğə göyməkdür səzasi.

*

Ey kərimi-əhədi-bihəmta,
Acizi-həmdin irür hər dana.

*

Künhi-zatinğə mələk heyrandur,
Qüdrətin birlə fələk gərdandur.

*

Şahü dərviş qapun möhtacı,
Hərəmin tövfin edənlər hacı.

*

Ey xudavəndi-kərimi-ə’zəm,
Etmədin mərhəmətin heç kimə kəm.

*

Kafili-rizqsənü dərdə əlac,
Xani-ehsanına əşya möhtac.

*

Kərəmü mərhəmətin sətri-üyub,
Şiveyi-məğfərətin əfvi-zünub.

*

Olmuşuz başdin əyağ ğərqi-günah,
Bəhri-ğüfranını qıl bizgə pənah.

*

Qüdrətindin səri-mu iki cəhan
Halətin bolmadı heç kimgə əyan.

*

Elmi-ğeybinğə bədayət yoxdur,
Künhi-zatinğə nəhayət yoxdur.

*

Əvvəlü axərü batin, zahir
Qamu sənsin bedəlili-bahir.

*

Budlər cümlə olurlər nabud,
Əbədüd-dəhr irürsin mövcud...

*

Dəhr ara, ya rəb, mənim dik mübtəlayi barmola?*
Könlü ğəmgin, çeşmi nəmgin binəvayi barmola?

*

Aşiq olan müqayyədü pakü təmiz gərək,
Könliğə yar ikki cəhandin əziz gərək.

*

Ey pərivəş, rahəti-ruhi-rəvanumsan mənim,
Canımın cananəsi, arami-canumsan mənim.

*

Bənaguşun təhidin xali-mişkin, mahi-tabanım,
Xəttə-səbz ilə zahir bolğalı bitab irür canım.

*

Ya pəb, ol gün bolay ki, cananım
Vəsl ilə şadiman edə canım?

*

Ğeyrə həmdəm boldu canan neyləyin?
Qalmadı tabi-dilü can, neyləyin?

* Barmı ola – varmı ola

*

Əğyarı görüm dərdü bəlalərğə tuş olsun,
Ümman tənizi ortasidə ğərğə tuş olsun.

*

Dedüm çün küfri-zülfiğə mana imandin artuqsin,
Dedi: bişək pərişanlıqda sən imkandin artuqsin.

*

Sərvinazım bolğalı gözdin nihan,
Hər tərəfğə seyli-əşkimdür rəvan.

*

Gər qürb məqamidə, könül, cahi sevərsən,
Aldanma cəhan mülkiğə, Allahi sevərsən.

*

Arizi gül, zülfü çü sünbül anın,
Boyni sürahivü ləbi mül anın.

*

Ərənlər götürdügünü salmiyə,
Öylə qalmadı, böylə həm qalmiyə.

*

Vəsl əyyamı yetişdi ey könül, şad ol yenə,
Həbsi-hicrandin ədu rəğmiğə azad ol yenə.

*

Xətmidür ol səfheyi-rüxsari-canan üstünə
Ya tolanmış halə nagəh mahi-taban üstünə?

*

Çit libas ilə olubsin surəti-Çin afəti,
Çin əgər desəm, nə surət, dil bilən din afəti.

*

Şeydayi könül eşqdə rüsvayi deyilmi?
Şol silsileyi-zülfdə sövdayi deyilmi?

*

Sərzəniş qılman anın eşqidə görsəm zilləti,
Aşiqi-sadiq olanın xarlıqdur izzəti.

*

Ey məhi-namehriban gəl bəri, zarın sarı,
Ta ki, nisarın bola əqlü dilü din yarı.

* * *

Sənsiz mana ləzzəti-həyat oldu həram,
Ey rahəti-can,
Bağrum qanı göz rövzənidin axdı təmam,
Çün seyli-rəvan.
Mövcudi-nəzər vücudunu görməgəli
Bihuş bolub,
İdrak edə bilməzəm nədür sübh ilə şam,
Əhvali-zəman.

# Məsnəvilər

İbtidai namə nami-həyyi-qədim
Oldu bismilləhi-rəhmani-rəhim.

Hər nə iş kim, başlasa əhli-səbil,
Şərt odur ki, edə bu ismi dəlil.

Ənbiyavü övliya qədri-rafi'
Tapdılar bu ismini eyləb şəfi'.

Afərinəş həddi irməs, bil yəqin,
Zikri-şükri-lütfi-rəbbil-aləmin.

Zahirü batin qamusin çün bilür,
Məhzi-xeyr irür hər işi kim, qilür.

Bar ümidüm kim, kərimi-zülcəlal
Müddəanı hasil edə bisual.

Ya ilaha, bir kəminə bəndəyəm,
Pürgünahü acizü şərməndəyəm.

Görə bilmən böylə müztər könlümü,
Qıl qənaətdin təvangər könlümü.

Necə şükr etgəy ki, xətmül-ənbiya
Ümməti qıldun bizi bimacəra.

İki aləmdə bu dövlət bəs bizə,
Hiç ümmət rütbəsi yetməs bizə.

Ol şəfi'ül-müznibinə e'tiqad
Rast bolğac üqdələr tapar güşad.

Kibri-nəfsi öldürən ğazi ola,
Mərd olanlar barcə sərbazi ola.

Əhli-həq dünyanı zindan bildilər,
Güllərin xari-müğilan bildilər.

Çünki həqdür cümləğə fəryadrəs,
Bolmağil bizikr, ey dil, bir nəfəs.

Yox mədari-ömrə, ey can, e'tibar,
Ğafili-vəqt olma, ta bar ixtiyar.

Pirliğdin qaməti görgəc düta,
Sidq əligə ber ibadətdin əsa.

Üzri-təqsirat üçün xunabi-dil
Eyni-ixlas ilə cari eyləgil.

Tərki-üstürlabü qilüqal qıl;
Təqvəvü taatini zədhal qıl.

Qanevü xürsənd bol məqsumğə,
Püşti-pa ur zalimü məzlümğə.

Keçgilən təqti'vü təklifatidin,
İxtiyar et xirqə təşrifatidin.

Qoygilən tuli-əməl sövdasini,
Nəhy saygil bu cəhan ğövğasini.

Etgilən tərki-həvayi-kibrü kin,
Tut təriqi-şər'i-xeyrül-mürsəlin.

Müctəba əcrini sane', həq, çələb
Eyləməs çün, ğəm yemə, çəksən təəb.

Ey kərimi-karsazi-biniyaz,
Binəvalığ birlə ahəngi-hicaz.

Tüşdi-başimğə besövdayi-əcib,
Zati-pakin hörmətiçün qıl nəsib.

Lütfün etdün çün dəlili-hər təriq,
Bu səfərğə eylə tövfiqim, rəfiq.

Öz-özümdən izdihami-şövq ilə
Söylərəm hər dəmdə yüz min zövq ilə.

Gəl, könül, qıl xeyrbadi-xasü am,
Bağla ehrami-rəhi-beytül-həram.

Həddü həsri yox əgər üsyanımın,
Binəhayət lütfü bar sultanımın.

Rövzeyi-xeyrül-ənamın tövfini
Eyləgəc rəf’ edə qəlbin xövfini.

Tüş yola, ləbbeyk hər dəm söylə key,
Arizular vadisini eylə tey.

Zikrguyan hər məqamı seyr elə,
Həmzəbanlığlar bevəhşü teyr elə.

Tərki-dünya birlə mafiha edib,
Yolğa düşgil, çərxə istiğna edib.

Tövbə həq dərgahidə irür qəbul,
Qılmasa nəfsin pəşimanü məlul.

Qılmayıb bətni həram əkliğə zərf,
Ömrü minbə’d eylə istiğfarə sərf.

Ey Əmani, nəfsdin almaq inan
Hər kişi həddi degil, bilgil əyan.

Hasil olmas hərfü sövt ilən bu hal,
Aləmi-qüds əhli olsan filmisal.

Lakin olğac şəmmeyi-lütfi-ilah,
Ruberah olur həzaran pürgünah.

Çünki pozmaz ev yiyəsi məyusin
Yastana görgil təvəkkül qapusin.

Sittəvü əlf irdi kim, bu məsvəvi
Oldu vaqe', eylədi könlüm qəvi.

Samini-zamin, Əli, Musa, Riza,
Məşhədində rəşki-firdovsül-üla.

Bar ümidüm, uşbu am içrə nəsib
Fəzli-həqq etgəy bu halati-əcib.

İntizami-silki-hüccacül-üzam
Mən günəhkariğədir beytül-hiram.

İlahi, sərnigun olsun bu gərdun,
Etibdü yarsız bağrum tolu xun.

Fələk bidadi qəddümni büküpdür,
Cigər xunabimi gözdin töküpdür.

Bəsər nuri nəzərdin getdi, neylim?
Dilü canımni bitab etdi, neylim?

Bu yanlığ tüşgücə canandin ayru,
Olaydum kaşki bən candin ayru.

Nə gecə bardur aramum, nə gündüz,
Bu halı görməsün aləmdə heç göz.

Ğəmi-hicran bəni divanə qıldı,
Xirəd kaşanəsin viranə qıldı.

Ölümdin sə'b imiş azari-hicran,
Görüm kim, qalmasun asari-hicran.

Mənim dik bolmasun məhcur heç kim,
Vüsali-dilbəridin dur heç kim.

Bəlayi-dərdi-bidərmanə tüşdüm,
Əcayib naləvü əfğanə tüşdüm.

Nə bir munis deyəm hali-dili-zar,
Nə bir müşfiq bola ğəmdin xəbərdar.

Vüsalın həsrəti canımda çoxdur,
Fəraq ənduhinin payanı yoxdur.

İməs xali dəmi könlümdin ahim,
Bu halətğə irür izəd güvahim.

Dəvasız dərd imiş ənduhi-hər şəb,
Ona uğraşmasun heç kimsə, ya rəb.

Könüldə qalmayupdur səbrü aram,
Bolalı ğayib ol rüxsari-gülfam.

Cüdalığ otu göydürdü tənimni,
Fəna badiğə berdi xirmənimni.

Bəsi avarəvü bixanimanəm,
Əsirü xarü zarü natəvanəm.

Fəraqi-nərgisi-fəttani-canan
Tənim bimarü eynim qıldı giryan.

Nigara, nuri-rüxsarindin ayru
Gecələr didəğə heç gəlməz uyğu.

Vüsalindin cüda, ey yari, ey yari-cani,
Gərəkməzdi vücudimdin nişani.

Bu xiclətdin bəsi bardur ğəmi-dil,
Öz əlgimdə deyil ölmək, nə hasil.

Gözü qaşın işarətlari, ey yar,
İrür canımda misli-nəşhi-divar.

Fəraqın hirqətidin, ey pərivəş,
İrür könlüm çü mu bər ruyi-atəş.

Xəyalın birlə canü dil edərlər
Həmişə bu ibarətni mükərrər.

Noleydi nagəhan canan gəleydi,
Bizi bu dərdü ğəmdin qurtareydi.

Zi dərdi-intizarü zülmi-əyyam
Ni etgəymin çü əz ağazü əncam?

Əyanundur təmam ey yar-cani,
Əmani zarının razi-nihani.

Cüzvü küll hövzeyi-fərmanində
Yavuq, iraq qamusi yanində.

Əhmədi-mürsəli qıldın Xatəm,
Əhli-küfr içiğə saldun matəm.

Ənbiya rütbəsidin me’racın
Oturub, geydi “liəmrük” tacın.

Görməmiş insü mələk bu əltaf
Eylədin şamili-övladi Mənaf.

Əliyi-alini bivasitəsiz
Hərəmi-möhtərəmin içrə təmiz.

Fatimə bətnidin etdin zahir,
Ey ülüləmri-rəhimi-qahir.

Övsiya bə’di-nəbiyyi-ali
Eylədin xəlqə Əliyyü ali.

Bivəlayi-Əlivü ali-nəfəs
Çəkməzüz, çün bu səadət bizə bəs.

Ey Əmani, eləgil xətmi-kəlam,
Hər nə həqq rə’yidür olsun sana kam.

Dün gecə yuxuda gördüm ani,
Dedi ki, necüksin, ey Əmani?

Vəslimdin iraq bekami-hicran
Avarəvü natəvanü nalan.

İzhar edəməzsin, ey giriftar,
Heç kimsəyə haləti-dili-zar.

Yə’qubi salıb fəraqə nakam,
Yusifi edib əzizi-əyyam.

Təmmüs qarını eşqə mayil
Edübəni, əqlin etdi zayil.

Məcnuni cünunə etdi məşhur,
Görsətdi göziğə Leylini hur.

Fərhad ilə Xosrovu qərinə
Şirin üçün etdi bir-birinə.

Biriğə vüsal pişə qıldı.
Biriğə nəsib tişə qıldı.

Hər qissəsidin əgər, Əmani,
Bir şəmmə desəm, tutar cəhani.

Bular qamu andin oldu yekta,
Bilgəy anı kim ki, olsa bina.

Biz cümlə fənavü həyyi-qayim,
Yox özidin özgə kimsə dayim.

Əzbəs ki, zəbuni-ğəm bolubsin,
Öz-özingə yanubən sönübsin.

Novmid olma ki, həq rəhimdür,
Min bir adının biri Kərimdür.

Ol kim, yanar odnu etdi gülzar;
Nəmrudini eylədi nigunsar.

İbrahimi eylədi sərəfraz,
Əşyanın içində etdi mümtaz.

Etdi betüfeyli-xeyli-Musa
Fironiləri ğəriqa-dərya.

Nuhə verübən nicati-tufan,
Qurtardı zi çəngi-bədseqalan.

# Hekayələr

## BİRİNCİ HEKAYƏ

Ravi nağıl etdi kim, iflas ara
Bir kişi qalmışdı həzin daima.
Faqəvü fəqr əlgida zarü nizar
Əhlü əyalidin olub şərmsar.
Ölimiğə razı olub hər zaman,
Başlar idi möhnətidin yüz fəğan.
Gərçi bəsi müflis idi lakin ol,
Tame’ olub kimsəyə sunməsdi qol.
Eyləməyüb söhbəti-xəlq ixtiyar,
Qanei-bir qürs idi leylü nəhar.
Zə’fü riyazətdin olub bəs zəbun,
Tapmadı ol, qürsünü həm neçə gün.
Nagəh edib xatirin ümmidvar,
Gəldi bedərgahi-şəhi-kamgar.
Ol ki, cəhan içrə olan çün cəhan,
Maziü müstəqbəli bilgən əyan.
Cədlərinin biri həbibi-cəlil,
Biri həm əqsamkəni-səlsəbil,
Həzrəti-Zəhra ona ümmi-əli,
Əmmi-təbari Həsən ibn Əli,
Şahi-şəhidan atası bigüman,
Madehi-Cibril əmin hər zaman,
Yə’ni ki, səccadi-əleyhissəlam,
Hamiyi-din, varisi-xeyrül-ənam.
Mö’mini-dərviş cəmalın görüb,
Səcdeyi-şükr etdi iraqdin durub.
Hacətə əl qaldurub etdi dua
Mədhü sənadin sora ol binəva.
Əcz ilə biçarəliq izhar edib,
Didələrin əbri-göhərbar edib,

Dedi ki, ey sahibi-təxt ilə tac,
Bir sürük oğlum uşağım bardur ac.
Cümləsi der: bizgə gərəkdür xörək,
Hiç cəhətdin tapaman bir çörək.
Ömür keçib, görməmişəm salü mah,
Şö’lə evim içrə yaxar bərqi-ah.
Qissəsidin ğüssələnib şahi-din,
Tökdü əqiq üstüğə dürri-səmin.
Boldu xəcil söyləgənindin fəqir,
Gördü çü riqqət edər ol binəzir.
Tərki-ədəbdür-dedi minbə’d qal,
Yerni öpüb getdi ol aşüftəhal.
Yolda çü həmsayələr uğraşdılar,
Getməkü gəlməkni xəbərlaşdılar,
Dedi: ğəmim şərhlərin ibtida
Çün elədim, halıma qıldı büka.
Çün görüb ol növ’ onu min özüm,
Öznü unutdum daxi bilməy sözüm.
Nagəh o halət içidə bir füzul –
Kim, bardı xarici ol naqəbul.
Hiylədə iblisğə ustad idi,
Xatiri qeybət deməgə şad idi,
Dedi, bəsi laf edər imamınuz,
Büləcəb ol kim, berəməs kamınuz.
Çün nəzər etsə zər olur tirə xak,
Neyçün edər giryəni ol zati-pak?
Mö’mini-müflisğə ləinin sözü
Gəldi yaman, dedi, yaşarıb gözü:
– Key siyəhüzlü səgi-pürkibrü kin,
Nəhsi-dəğəl, fasiqi-biəqlü din,
Söylədin ər büğzü həsəddin yaman,
Mahğə it əf-əfidin biziyan.
Mö’minin oldu çü imam yarici,
Boldu peşiman sözüdin xarici.
Yoldin edib övd bedərgahi-şah,
Barmadı öz eviğə ol mərdi-rah.
Yetgəc öpüb sidq ilə dərgahini,

Gördü əyan əncüməni-şahini.
Əmr ilə çün məclis ara tapdı bar,
Qıldı həzin xatirin ümmidvar.
Etmədin izhar mübahislərin
Söylədi əshabğə şəh cümləsin.
Ta kim, ola kur ləinlər gözü,
Rəmzi-vilayət bilə həzrət özü.
Berdi zibə'di-həmə göftü şinov
Mö'mini-müflisğə iki qürsi-cov.
Dedi ki, bu qürsləri həq-çələb
Vüs'əti-rizqinğə qılıbdur səbəb.
Qürsləri aldı, fərəhnak olub,
Eviğə əzm eylədi, çalak olub.
Qürslər irdi çü bəsi xüşkü səxt,
Dedi: həman beh ki, qılam ləxt-ləxt.
Əl və tişi qürslər ilən sitiz
Qıldı bəsi, leyk qoparmadı çiz.
Yetdi çü bazarğə şare' ara,
Gördü balıq satğuci bimacəra.
Mucibi-şər' ilə edib şərti-əqd,
Bey' qılur balığı bacinsü nəqd.
Yanığa barıb dedi: – Key pakdin,
Ya rəb, olurmu ki, bu qürsün birin,
Lütfü tərəhhümlə bevəchi-Həsən,
Alğasənü bizgə balığ bergəsən?
Gördü ki, əcz ilə qılur iltica,
Qürsü alıb, balığı berdi ona.
Tapmış idi mətni-əzim ol səmək,
Müşkül idi binəmək anı yemək.
Möhnətü rənc ilə yetib caniğə,
Gəldi fəqir tuz satanın yaniğə,
Söylədi bir qürsni həm sin alıb,
Ətəgimə gər bir avuc tuz salıb,
Göndərə bilsən məni evüm sarı,
Şad olur oğlum-uşağum barı.
Həsbi-rizası bilə ol tuzsatan
Evi sarı eylədi anı rəvan.

Eviğə gəltürdi bilareybü şək
Mö'mini-dərviş səmək banəmək.
Pak edər ikən səməki gördü kim,
Çıxdı içidin iki dürri-yətim.
Gövhəri-nayab olar irdi bəs,
Qiymətini bilməs idi hiç kəs.
Lə'l ilə yaqut rəvacı idi,
Hər biri yüz mülk xəracı idi.
Dürləri alğac ələ ol mərdi-rah
Səcdeyi-şükr etdi, dedi: Ya ilah
Ali-əba hörməti üçün mana
Lütfü əta kim, elədin xəlq ara,
Min yil əgər şükr desəm mən həmin
Söyləyə bilmən daxi mindin birin.
Əndühi-iflasdin azad olub,
Öz-özü birlə der idi şad olub:
Mən kibi barmola muradın tapan,
Möhnəti rahətğə mübəddəl bolan?
Oğlu, qızı, övrəti sönüşdülər
Zümzümələr edübəni coşdülər.
Od və odun təbx üçün gəlturub,
Cümleyi-əsbabı mühəyya qılub,
Balığı pakizə yuyub biqüsur,
Büryan edib, asdılar, dərtənur.
Açmamış ikən o, tənurin başın,
Gördü ki, bir kişi dögər qapusın.
Dedi: Nə istərsən, aya mərdi-hürr?
Söylədi kim, aç qapunı, xeyrdür.
Qapu açub bir-biri çün gördilər,
Əczü təvazö' edübən durdilər.
Dedi o, dərvişğə: Mərdi-əziz,
Qürslərindin yemək olmadı çiz.
Söylədilər balığ ilən tuz verən,
Bu iki qürsü ol əsiri-mühən
Qut eləsün həmrəhi-əhlü əyal,
Balığü tuzni ona qılduq həlal,
Qürsələri aldı, bolub şadkam,

Xeyr-dua qıldı olarğa tamam.
Evə gəlib şərhini başdin əyağ
Söylədi, fəhm eylədi oğul-uşaq.
Zövq sədasın buraxıb dərcəhan,
Söylədilər, cümlə bolub yekzəban:
Şükr həqin dərgəhiğə kim, çenin
Eylədi mümtaz bizi barcədin.
Cümləsi balığ ətidin toydular,
Münkirinin gözlərini oydular.
Şamgəh irdi ki, birav nagəhan.
Gəldi, dedi: Qürsləri, ey filan,
Şah buyurdu ki, gətürsün bilə,
İstəgini tapdı çün ol sidq ilə.
Dürlərü qürlərni alıb əligə,
Mədhü səna vird qılıb tiligə,
Rəmzi-vilayətğə sərəfraz olub,
Düşdü yola, sidq ilə dəmsaz olub.
Zövqü sürur ilə edib qət'i-rah,
Gəldi fərəhnak bedərgahi-şah
Turdu ədəb şərti bilə bir zəman,
İndədilər məclis ara nagəhan.
Qürslərü dürləri məcmə' ara
Zahir edib dedi: Əya rəhnüma,
Əvvəlü axırda bu iş tərhini
Çünki bilürsən, nə deyim şərhini.
Şəh dedi kim, qürsləri ver geri,
Bardurur munda ərənlər siri.
Timək onu özgəgə düşvar irür,
Biri sühurü biri iftar irür.
Həq çü yetürdi nəsibin ğeybdin,
Cümlə işin xali irür eybdin.
Dürləri et vəchi-məaş özünə,
Rizq eşşigin açdı çü həq qüzünə.
Həqdin olur bəndəğə çün lütfi-xas,
Ğəmdin edər bir səbəb ilən xilas.
Əmr sənindür, dedi, ya şahi-din,
Hər nə ki, hökm eyləsən oldur güzin.

Dürlər alıb, qürsləri tapşurub,
Qopdu evi sarı bəsi şad olub.
Gecə çü keçdivü səhər urdu dəm,
Getdi könül güzgüsidin rəngi-ğəm.
Nagəh uş ol hal içidə bigüman,
Yetdi qəzadin bir ağır karvan.
Mö'minə çün lütfi-əbəd yar idi,
Taleyi imdadı bilən bar idi.
Qafilənin ortasidə bir kişi –
Kim, dürr alıb-satmaq irürdi işi,
Simü zəri vəznü ədəddin bürun,
Bəlkə nə kim, til degəy andin füzun.
Küçəvü bazarğə saldı nida,
Kimdə ki, bar lə'lü düri-bibəha.
Kəltürüb alsın əvəzin zərrü sim,
Həsbi-rizası bilə bivəhmü bim.
Berdi nişan xacəğə bir cövhəri –
Kim, filanındur iki gövhəri.
Qılmamış heç əsrdə ğəvvasi-əql,
Bəhri-təxəyyüldin olar təkni nəql.
Eşidib ol sözni cəvahirfüruş
Eylədi bey'ətiğə rəhn əqlü huş.
Dedi ki, ey müjdədəhi-bimisal,
Lö'lələrin sahibi ola mərdi-hal.
Nerdə isə dur gedəli tezrəgin
Sərf edübən simü zərin barcəsin,
Dürlər alıb ğeyr ürəgin yaralı,
Dünyada bir ad qoyuban baralı,
Getdilər ol mö'minin evi sarı,
Xacə bilən əncümən əhli barı.
Bə'di mülaqatü təvazö' bəsi
Etib uş ol mö'min ilən cümləsi.
Söylədilər: Gəlmişüz, ey möhtərəm,
Lö'löyi-şəhvarlər üçün bu dəm.
Vüs'əti-rizq olmuş olar çün sizə,
Hər nə ki, məqsud irür al ver bizə.
Müştərinin sözlərini istima

Etdi, dedi: – Bey’ üçün min niza
Eyləməyübdür, beribən biğərəz,
Hər nə mürüvvətdisə bergil əvəz.
Xacə dedi: – Mən daxi, ey pakdin,
Hər nə ki, bar cümlə tüfeyl eyləyin.
Hikməti-sidq əmridə haziq bolub,
Bir-birinin qövliğə sadiq bolub,
Əqdi-üxüvvət tutub əzcanibeyn
Eylədilər əhdi-könül fərzi-eyn.
Lö’löləri mö’mini-pake’tiqad
Dərnəzəri-xaceyi-nikunəhad
Hazır edib, eylədi təklif çün,
Xacə həm etdi kə, nəfini bütün:
Aləm ara sən kibi bir gerçək ər
Görəmədüm, munca ki, qıldum güzər.
Bu ni sifət mehrü məhəbbətdürür,
Bu ni degən lütfü mürüvvətdürür.
Şadlığ əşkin axıyıb gözidin,
Tüşdü əyağığa, barıb özidin.
Tapdı o halət içidə özgə hal
Xaceyi-fərruxrüxi-şirinməğal.
Söylədi: – Xadimlər, olun tez rəvan,
Dünəliğim hər nə ki, bardur zəman,
Gəltürünüz uşbu mənazil sarı,
Mö’min əximğə hibə qıldum barı.
Mucibi-fərman ilə bimacəra
Eylədilər hazır o məclis ara
Simü zəri-bihədü əcnasi-xas,
Hər biri bir yerdin olub ixtisas.
Əncümən əhli görüb andaq xisal,
Büləcəb işdür dedilər uşbu hal.
Leyk olar mənliği eyləb hiba,
Şahi-vilayətğə qılıb iqtida,
Gənci-həqiqətdin olub bəhrəvər,
Simü zərü lö’löğə qılmab nəzər,
İkisinin könlü bilə bir bolub,
Bir-birinin əyağığa baş qoyub

Söylədilər ta bola candin rəməq,
Şərt bu kim, bir nəfəs ayrılməyəq.
İkisi icabü qəbul eyləyib,
Nəfsi könül şahiğə qul eyləyib,
Bir-birinin həsbi-rizası bilə
Ömrünü sərf eylədilər sidq ilə.
Sə'yi-Əmani həm odur kim, qıla
Yari-vəfadarığa canın fəda.

## İKİNCİ HEKAYƏ

Ey kim, iməs zatına vəsf ehtiyac,
Bermiş iki aləmə sün'ün rəvac.
İnsü mələk birlə vühuşü tüyur
Rabiteyi-rizqdə tapmay qüsur.
Bulmamış ikən əsəri-zihəyat
Rizqi müqərrər olunur ta məmat.
Hər kimə ənvai-vəsayil bilə
Rizq yetəy qisməti-kamil bilə.
Öylə ki, bir qafilə qövmi-ərəb
Hatəm Tey qəbri-üzə pürtəəb,
Bimi qazaqdin tüşübən qaldılar,
Yüklərini xövf bilə saldılar.
Yox idi heç qism yeməkdin nişan,
Aclıq almışdı əlindin inan.
Qafilə əhlidə birav nagəhan
Qəbrğə göz tikdi, dedi: key filan,
Əkrəmi-bizzeyf idi çün vərzişin,
İmdi daği şol rəvişi qıl işin.
Çünki yetişdük sana biz mihman,
Eylə mühəyya bizə bir bəzlxan.
Nagəh uş ol hal içidə bir simiz
Bəsrəkinə vaqe' olub xöftü xiz,
Tüşdü əyağdin, qoyuban baş yerə
Qıldı təəccüb əyəsi bu sirə.
Bağrını heyrət odu etdi kəbab,

Til uzadıb atəmə qıldı xitab.
Dedi ki, cəşn eyləmək el malidin
Bədtər irür oğrular əhvalidin.
Böylə kərəm daxili-imsak irür,
Ni rəvişi-aləmi-idrak irür.
Söylədi bir şəxs ona, key füzul,
Bolmamısın böylə deməkdin məlul?
Hatəmə xətm oldu əzəldin səxa,
Böylə demək leyk ona irməs rəva.
Qafilə əhli dərisin soydular,
Ol gecə bəsrək ətidin toydular.
Sübhü tulu' etdi çü həq qüdrəti,
Nurə bədəl boldu gecə zülməti.
Mindi fələk buxtisiğə çün quyaş.
Pumü həbəş xeyliğə tüşdü savaş.
Nagəh ol əsnadə bolub aşikar
Gəldi bir ə'rabiyi-üştürsəvar.
Bir tivə həm öz tivəsinə qatıb,
Ətməkü ət arxasiğə yüklatıb,
Müştəbeh olqan tivəgə hey'əti,
Baxmağivü yerişivü sür'əti,
Qafilə əhli dedilər: key cəvan,
Baisi-gəlmək ni idi bigüman?
Söylədi: Dün gecə həzinü dijəm
Vaqiədə hatəmi-sahibkərəm
Gəldi tuşumizgə – dedi bir qonaq,
Aytdı: gərəkdür bizi ağırlamaq.
Min həm anın bir tivəsin vam edib,
Qafilənin əhliğə ən'am edib,
Yaxşı-yamanı qamu ağırladım,
İkiliği tərk edibən birladım.
Ğerdi nişan cüssə bilə muyini,
Yükləməkü tüşməgidə xuyini.
Borcun əda edib olan üzürxah,
Tizrək andin kim, ola ruberah.
Müstəhəqə həqqini hasil edün.
Surəti-hilliyyəti hasil edün.

Cudü səxa himmətidür bu sifət –
Kim, tapalar türbətidin mənfəət.
Dürdi-meyi-himmət irür, saqiya,
Cümlə mərəzlərğə əzəldin dəva.
Sunqil Əmaniğə beəltafi-xas,
Ta kim, ola zöhdü riyadin xilas.

## ÜÇÜNCÜ HEKAYƏ

Bir qarı kim, xərfliği yar imiş,
Beş oğulu və bir ləkü bar imiş.
Lakin oğlanlarıdin artuğraq
Sevər idi lökünü şol andaq –
Kim, saçanda buduna lök südük,
Yapuşurdu qıçına misli-sülük.
Mümkün irməsdi gər təkəllüm ona,
Bar idi gövşəmək təbəssüm ona.
Nagəhan çeşmi-rəhmi-çərxi-nigun,
Taleyi-vajəgunü bəxti-zəbun
Hiyləvü rif birlə sə'yi-təmam
Etdilər ta ədəm yoliğə xüram.
Qaldı biçarə lök həm avarə,
Baxmayubən cəhazü əfsarə,
Sıçradı, palçığa batub öldü,
Qarının bənzi ğüssədin soldu.
Şivən edib bağırdı daylaq dik,
Gah ənba olurduvü gəh cik.
Hər kimə ol əcuzi-fərsudə
Löv sözün söylər idi bihudə.
Qonaqu qonşu qarının sözidin
Usanıb, nifrət etdilər yüzidin.
Lök bəhasını qarı övladı
Gətürüb dedilər ki, fəryadı
Etməyib al bu məbləği, zinhar,
Saxla yanında, saymagil düşvar.
Ağçanı aldı, qoydu cibinə,

Baxmayıb hiç şəkkü ribinə.
Nagəhan bir neçə qonaq gəldi,
Qarı bağrını ğüssələr dəldi.
Eyləyə bilməz idi kim, izhar
Etməyə lök halətin təkrar.
Dedi: – Oğullar, ağçanız alınız,
Həmyanınız içiğə həm salınız.
Lökcüyəzimni bən heç unutmazam,
Vəsfinin nəqli bilə dəmsazam.
Ağçanı atubəni qıldı itab,
Başladı lök sözün növhə xitab.
Qissəvü qüvvəsi bu irdivü bəs,
Ta əcəl qıldı ona qət'i-nəfəs.
Adəmə olıcaq hər iş mö'tad,
Rəf' iməs, ey Əmani, ta miad.
Böylədür çünki lazımi-insan,
Berməgil nəfəsinin əligə inan.

## DÖRDÜNCÜ HEKAYƏ

Eşitdüm, öz-özünə dün der idi,
Biri kim, iki vəqt əfyun yer idi.
Dəriğə, həsrəta, dərda ki, tiryak
Zəif etdi tənim, məhv oldu idrak.
Keçərsə bir nəfəs vəqti, çıxar can
Bədəndin istəmək həngami asan.
Görünür xəlqə ətvarim əcayib,
Neçük kim, tapmışam vəz'i-ğərayib.
Nə bimarəm, nə tən salim, nə bidar,
Nə dərxabü nə xud məstü nə huşyar.
Nə gerçək mərdü nə xunsavü nə zən,
Cəmadi-məsx bihiss basərü tən.
Mühiqdir vaqe'i ol zar əbtər –
Kim, irməs qədri toprağə bərabər.
Neçük bolğay çirağının füruği,
Çü etməs fərq sidq ilə düruği.

Həqiqətsizlik ətvarı həmişə,
Xilafi-qövl iqrarı həmişə.
Gəhi mülki-zərafat padşahi,
Kəsafət birlə gahi kəm zidahi.
Çoxun gördük edib ol vəz'i təğyir,
Xilas oldu ziruyi-əqlü tədbir.
Bolub əmsalü əqran içrə sərxeyl,
Dəxi ol şumə hərgiz etmədi meyl.
Qamu tiryakilərğə biməlalət
Zəhi dövlət nəsib olsa bu halət,
Bu iş tövfiqi-həqdür, ey Əmani,
Yetər, qıl sərzəniş ol natəvani.

## BEŞİNCİ HEKAYƏ

Tanrının aslanı Əliyyü Vəli,
Vaqifi-övzayi-xəfiyyü cəli,
Bə'di-bəni hübbi olan fərzi-eyn,
Əmri-xilafətğə berən zibü zeyn.
İnsü mələk, vəhşü tüyurü siba'
Barcəsiğə bar idi əmri müta'.
Eylədi ol padşəhi-bəzmü rəzm.
Kəsbi-həva eyləməgə əzmi-cəzm.
Gərm olicaq şiveyi-seyraniğə,
Tüşdü yol aslançinin eyvaniğə.
Gördü ki, bar bir neçə aslan əsir,
İçləridə bar idi birisi pir.
Eylədilər cümləsi təslimlər,
Beribəni bir-birə tə'limlər.
Özləri adabidə məsrur olub,
Söylədilər barcəsi məşkur olub:
Həzrəti-həq dərgahiğə yüz sipas
Hər nəfəs etmək bizə az biqiyas.
Ərsəlanın təl'ətini biniqab
Hörübən, olduq qamumuz kamyab.
Neçük edəy şəmmeyi-lütfün bəyan,

Bar bu əta şükriğə qasirlisan.
Qaricə aslan dedi: Ya şahi-din,
Tö'mə gələndə oluram bəs ğəmin.
Cümlə bu yoldaşlar irürlər cəvan,
Min qarivü acizəvü natəvan.
Tö'məni edərlər olar tez təmam,
Ac qaluram min qariyi-nabekam.
Şah buyurdu ki, bu sözlərni qoy,
Səbr eləniz qamuvü sin yeyü toy.
Dəxl eləsinlər bu nəhclə müdam,
Tö'mğə minbə'd igitlər təmam.
Əmr sənündür, dedilər, ya əmir,
Hökmə müti'üz qamü dürnavü pir.
Tapdı çü fərmani-şərifi əməl,
Oldu qarı aslana müşkili həl.
Tabe' irür əmriğə heyvan anın,
Sidq ilə can yoluğa qurban anın.
Çün kim, irür cümləğə fəryadrəs,
İki cahanda bizə bar hübbi bəs.
Bəndə Əmani ki, səgi-kuyidür,
Ta rəməqi cismidə bar xoyidür.
Toz qılıban cismini mövlasiğə,
Tiğ-təbər həm urar ə'dasitğə.

# Qoşmalar

Zayiründür övliyavü ətqiya,
Höccəti-samin, Əli, Musa, Riza.
Göz tikübdür qapuna şahü gəda,
Höccəti-samin, Əli, Musa, Riza.

Rövzeyi-pakın ki, bar rəşki-cinan,
Hər rəvaqidür məlayik aşiyan.
Zahirü batin sana irür əyan,
Höccəti-samin, Əli, Musa, Riza.

İnsü cinn şeydavü bitabın sənin,
Cənnət əhli cümlə əhbabın sənin,
Amini-zamindür əlqabın sənin
Höccəti-samin, Əli, Musa, Riza.

Çün şəfi'ül-müznibinsən, ya imam,
Bu səadət bizgə bəs yövmül-qiyam.
Bar adın virdi-məlayik sübhü şam,
Höccəti-samin, Əli, Musa, Riza.

Ey zərihin qibleyi-hacat olan,
Nitqinin tutisiğə mir'at olan,
E'tisami-üzri-təqsirat olan,
Höccəti-samin, Əli, Musa, Riza.

Gülşənindin hurü qılman gül dərən,
Günbədindür günğə hər gün nur verən.
Tövfin edənlərğə hər dəm feyz irən
Höccəti-samin, Əli, Musa, Riza.

Rövzənə ruhül-əmin fərraşlıq
Etsə, tan irməs ki, bar sirdaşlıq,
Mehr edər görgəc yüzün xəffaşlıq
Höccəti samin, Əli, Musa, Riza.

Qütbi-afaq oldu hər bir xadimin,
Bazgəştidür qapun, hər nadimin.
Ərzi-hal irdi ğərəz iradimin
Höccəti-samin, Əli, Musa, Riza.

Bir məlayik birlə bihədd bəşər,
Həmsəbəq hafizlərin şamü səhər.
İzlərinin tozi mazağül-bəsər
Höccəti-samin, Əli, Musa, Riza.

Hər səhər müğlər yilər əlhanidin,
Əhli-dərdin dideyi-giryanidin
Axsa əşki, yol tapar dərmanidin
Höccəti-samin, Əli, Musa, Riza.

Qətreyi-əşkin edən dürdanələr
Oldilər şəm'in görüb pərvanələr.
Can verürlər rəşkdin fərzanələr
Höccəti-samin, Əli, Musa, Riza.

Talibani-elm hər tədrisdə
Əksəri dərsi oxub təhsisdə.
Cəm' olurlar məclisi-təqdisdə
Höccəti-samin, Əli, Musa, Riza.

Həbbəza carubkəşlər müttəsil
Eyləmişlər səhnidin xüldü xəcil.
Varidindin zayil olur rəngi-dil,
Höccəti-samin, Əli, Musa, Riza.

Bar Əmani şərmsarü rusiyah,
Əfvi-təqsiratı üçün üzrxah.
Eyləmiş lütfün bedərgahi-ilah
Höccəti-samin, Əli, Musa, Riza.

* * *

Bahar oldu, tazə güllər açıldı,
Sərvinazım, sallanubən seyr elə.
Şükufə övrağı hər yan saçıldı,
Sərvinazım, sallanubən seyr elə.

Can bəslənür e’tidali-həvadin
Dərdlü olan çəkməz minət dəvadin,
Hər məqamda qulaq dolar nəvadin,
Sərvinazım, sallanubən seyr elə.

Müəssərdür əndəlibdin nalələr,
Saçmış incü səbzə üzrə jalələr,
Eşq odundin dağlar qoymuş lalələr,
Sərvinazım, sallanubən seyr elə.

Hər səhfəsin tərtib etmiş gülün ğeyb,
Öylə kim, heç tapmaq olmaz anda eyb,
Ğənimətdür yetişməgəy vəqti-peyb,
Sərvinazım, sallanubən seyr elə.

Yaz fəslində səhər quşlar əlhani
Mədhuş edər idrak edən insani,
Bitəkəllüf xürrəm olsun Əmani,
Sərvinazım, sallanubən seyr elə.

Ağzın sirrin ğönçə guya eyləmiş,
Ğəmzən sehrin nərgis peyda eyləmiş,
Laləni rüxsarın rüsva eyləmiş,
Sərvinazım, sallanubən seyr elə.

Xürrəm olmuş səbzələrdin hər vadi,
Əndəlibi nalan etmiş gül yadi,
Xəcil etgil ən’ər ilə şümşadi,
Sərvinazım, sallanubən seyr elə.

* * *

Yüz sürüb gedər olduq imamə,
Sidqi rəhbər edib, könül, əzm elə.
Yol verdi, məşvərət etdük kəlamə,
Sidqi rəhbər edib, könül, əzm elə.

Bu yol gedən qılmaz lafi-kəzafi,
Canu dildin olur sufiyi-safi.
Yetmiş həccdür İmam Riza təvafi,
Sidqi rəhbər edib, könül, əzm elə.

İnsü cinn ol həzrətin bitabidür,
Samini-zamin anın əlqabidür,
Kə'beyi-dil rövzəsinin babidür,
Sidqi rəhbər edib, könül, əzm elə.

Astanidürür mülki-aşiyan,
Anda zairlər taparlar tazə can,
Bu səadətdin bolub əhli-cinan,
Sidqi rəhbər edib, könül, əzm elə.

Ğubari-kuyinin çoxdur xəvasi,
Ona yetən tapar ğəmdin xilasi,
Zairi olan olur xaslər xasi,
Sidqi rəhbər edib, könül, əzm elə.

Əltafidin bir qətrədür dəryalər,
Rövzəsidə bina olur ə'malər.
Dərgahində vardur yüz min şeydalər,
Sidqi rəhbər edib, könül, əzm elə.

İki aləmdə sərəfraz olmağa,
Təəllüqlərdin biniyaz olmağa,
Gecə-gündüz zikrə dəmsaz olmağa
Sidqi rəhbər edib, könül, əzm elə.

Ümmid oldur ki, yüz dərgahə yetə,
Bu mənlik məhv olub can şahə yetə.

Şahına yetən nəfsin Allahə yetə,
Sidqi rəhbər edib, könül, əzm elə.

Mö’ cüzünün yoxdur həddü payani,
İzhar etmək olmaz sirri-nihani.
Vəfa qılmaz çün heç kimə bu fani,
Sidqi rəhbər edib, könül, əzm elə.

İki saymaz həqqin birligin bilən,
Nəstə çatmaz mənlik də’visin qilən,
Bilmək üçün şə’ni həqiqət ilən,
Sidqi rəhbər edib, könül, əzm elə.

İki aləm şahənşahıdur ol şah,
Yüzün ona dutana olur pənah,
Xövf iməs gər yer yüzün dutsa sipah,
Sidqi rəhbər edib, könül, əzm elə.

Vird eyləgil həqiqin Qur’anı ilən,
Ziyarət şərtini bəyani ilən.
Əfvi-günah üçün Əmani ilən
Sidqi rəhbər edib, könül, əzm elə.

# Gəraylılar

* * *

Tövfi-kuyinə irməgə
Könül daim niyaz eylər.
Məhəbbət gülün dərməgə
Can bülbülü pərvaz eylər.

Eşq odunun sönməz közü,
Əcnəbi bilməz bu sözü.
Mövcuddur hər şeydə özü,
Gəh niyazü gəh naz eylər.

Xaki-payinə mayiləm,
Astanidə sayiləm,
Qəhrü lütfünə qayiləm,
Gərək çox, gərək az eylər.

Aşiqlər silkində olan
Pakbin bolmas bigüman,
Bənzər ona kim, bir nadan
Təharətsiz namaz eylər.

Əmani, sən onu tani,
Ğeyrini saygilən fani.
Eşqidə sadiq olani
Aqibət sərfəraz eylər.

* * *

Eşq oduna yandı bağrım,
Ya rəb, görəmmi didarın?
Dağdan ağır oldu ağrım,
Ya rəb, görəmmi didarın?

Ey adı zikrül-lisanım,
Yadindin qut tapan canım,
Vaqifi-razi-nihanım,
Ya rəb, görəmmi didarın?

Qaçıpdur gözlərdin xabım,
Gecə-gündüz yoxdur xabım,
Mətləbi-şeydü şəbabım,
Ya rəb, görəmmi didarın?

Çünki bəzmindin irağəm,
Ölüyəm, noldu gər sağəm,
Ğayətül-ğayət müştağəm,
Ya pəb, görəmmi didarın?

Əm etməkdin ötrü yarəm,
Daxi qalmadı mədarəm,
Səndin özgə yoxdur çarəm,
Ya rəb, görəmmi didarın?

Tazədür hüsnün gülşəni,
Can bülbülü istər səni,
Fanidür şu dünyə fani,
Ya rəb, görəmmi didarın?

Kilki-qəza rəqəm çaldı,
Məni səndin ayru saldı,
Fələk intiqamın aldı,
Ya rəb, görəmmi didarın?

Hicri canuma kar edən,
Könlümü biqərar edən,
Bimarinə timar edən,
Ya rəb, görəmmi didarın?

Əmaniyəm sənin zarın,
Əzəlidin giriftarın,
Həddin ötdü intizarın,
Ya rəb, görəmmi didarın?

* * *

Fələk rəğminə bir nəzər,
Görsəm yüzün cananımın.
Qalmaz dərdü ğəmdin əsər,
Görsəm yüzün canınımın.

Həddin ötdü intizarı,
Qalmadı könlüm qərarı,
Canü dil olsun nisarı,
Görsəm yüzün cananımın.

Etipdür ənduhi-hicran
Gərçi könlümü pərişan,
Hər müşkülüm olur asan,
Görsəm yüzün cananımın.

Topu meydandin qapardum,
Yıxılanımı yapardum,
Könül istəgin tapardum,
Görsəm yüzün cananımın.

Dəvasız dərdin dəvasın,
Binəva könlüm nəvasın,
Tapam canum müddəasın,
Görsəm yüzün cananımın.

Dövləti-vəslinə fürsət
Tapubən məhv olsa firqət,
Əmani, çəkməzdüm həsrət,
Görsəm yüzün cananımın.

* * *

Qəddü yüzün mənsux etdi
Qədrini sərv ilə gülün.
Verdi badə mişkin zülfün
Ətrin reyhanü sünbülün.

Ey sevgülü sərvi-nazum,
Məhrəmi hər gizli razum,
Çarəsazum, dilnəvazum,
Sən gülsən, mənəm bülbülün.

Təbəssümlə ğönçən açdun,
Xəndan olub güllər saçdun,
Əql aparub gözdin qaçdun,
Pərişan edüb kakilün.

Bilmən nə cövhərsən, ey can,
Heyranındur mələk, insan,
Gərçi nihandansan nihan,
Aləmə düşmüş ğülğülün.

Hədsiz bitabı olmuşam,
Suzan kəbabı olmuşam,
Məstü xərabı olmuşam
Lə’li-ləbindin ol mülün.

Atəşin gül cövrün çəküb,
Ğəm yeməgil, ey bülbül, köp,
Öylə saygil kim, köydürüp
Gögər sarıdupdur külün.

Ta əsər var candan təndə,
Əmani qapunda bəndə.
Mövcud etmiş çün həq səndə
Əslini cüzv ilə külün.

* * *

Fürsət olicaq hər dəmdə
Ğənimətdür səfa sürmək.
Könül əglənməsə ğəmdə,
Ğənimətdür səfa sürmək.

Suri–yarı həmraz edib,
Müğənnilər dəmsaz edib,
Mütrüblər həm avaz edib,
Ğənimətdür səfa sürmək.

Söhbət olqac əzmi–cəzmə,
Əcnəbini qoyma bəzmə,
Keyfiyyətsiz bir dəm gəzmə,
Ğənimətdür səfa sürmək.

Yenə gəldi bahar fəsli
Eyş etməkdür anın əsli,
Müyəssərin olsa vəsli,
Ğənimətdür səfa sürmək.

Dürüst olicağız yəqin,
Taparsan könül istəgin.
Seyr eylə məhəbbət bağin,
Ğənimətdür səfa sürmək.

Eşq bimarının timarı
Kam ilə görməkdür yarı.
Asan edər hər düşvarı,
Ğənimətdür səfa sürmək.

Eşq oduna yanan sönməz,
Gedən günlər geri dönməz,
Ömrün quşu uşdu qonmaz,
Ğənimətdür səfa sürmək.

Dünyanın yoxdur vəfasi,
Zahir degil müddəasi,
Hər bəqanın var fənasi,
Ğənimətdür səfa sürmək.

Varlığını saygil fani,
Məhəbbət məqamın tani,
Əhli–hal ilə, Əmani,
Ğənimətdür səfa sürmək.

* * *

Hicran kar etdi canıma,
Bilmən nolacaqdur halım.
Dövran susadı qanıma,
Bilmən nolacaqdur halım.

Bari-ğəm qəddim xəm etdi,
Səbrü aramum kəm etdi,
Xarü zari-aləm etdi,
Bilmən nolacaqdur halım.

Füzun cünunəm Məcnundan,
Seyli-müjganım Ceyhundan,
Əfğanım ötdü gərdundan,
Bilmən nolacaqdur halım.

Halətim ibrət olupdur,
Rahətim möhnət olupdur,
Adətim riqqət olupdur,
Bilmən nolacaqdur halım.

Göz görmək istər cəmalın,
Könüldə daim xəyalın,
Müyəssər olmaz vüsalın,
Bilmən nolacaqdur halım.

Ayrılıq yulduzu batmaz,
Gecə vayimdən el yatmaz,
Sənsiz könül nəstə çatmaz,
Bilmən nolacaqdur halım.

Firqətindin, canım cani,
Ahum tar etdi cəhani,
Zarəm manəndi-Əmani,
Bilmən nolacaqdur halım.

* * *

Lütfi-pərvərdigarimdin
Könül istədügin tapdım.
Əsərü-ahü zarimdin
Könül istədügin tapdım.

Çəkdüm gərçi dərdi-hicran,
Hədsiz edib ahü əfğan,
Mədəd olub feyzi-sübhan,
Könül istədügin tapdım.

Rəvan olurdu gözdən nəm,
Çəkər idim dərdü ələm,
Bihəmdilləh, rəf' olub ğəm,
Könül istədügin tapdım.

Mənəm, ya rəb, səubətdən,
Yüz dürlü dərdü möhnətdən,
Qurtulub çəngi-firqətdən,
Könül istədügin tapdım.

Rəvan olğac qəddi-dalum,
Səmərlər verdi nihalum,
Müddəaca olub halum,
Könül istədügin tapdım.

Təqribsiz irür beğayət
Etmək tale'din şikayət,
Çün befeyzi-binəhayət
Könül istədügin tapdım.

Tökülən gərçi dolmadı,
Düşmən deyən həm olmadı,
Məhəbbət gülü solmadı,
Könül istədügin tapdım.

Əmani, məqsədi-mühsəl
Oldu həsbül-vəchi-əshəl,
Bu səadət yetər mücməl,
Könül istədügin tapdım.

* * *

Ahü əfğandur həmdəmim
Sevgülü yarumdən ayru.
Nəhayətsiz oldu ğəmim
Sevgülü yarumdən ayru.

Giriftarəm əcəb halə.
Sevdam yoxdur mülkü malə,
Ney dik bilmən ğeyri-nalə
Sevgülü yarumdən ayru.

Tabü təvanım qalmadı,
Bədəndə canım qalmadı,
Ahü fəğanım qalmadı
Sevgülü yarumdən ayru.

Nə yuxlaram, nə oyağam,
Nə sayruyam, nə xud sağam.
Ğəm zindanında dutsağam
Sevgülü yarumdən ayru.

Bisərü saman olmuşam,
Saralmış xəzan olmuşam,
İyəsiz filan olmuşam
Sevgülü yarumdən ayru.

Fələk, eylədün bildügün,
Canıma qoydun min dügün,
Zarlığdur işim dünü gün
Sevgülü yarumdən ayru.

Lal olmuş bülbülə döndüm,
Pərvanə dik yandum, söndüm,
Filməsəl, düz yurda qondum
Sevgülü yarumdən ayru.

Yoxdur, Əmani, səri-mu,
Mehrim olsa gər yüz məhru,
Cənnət gülün eyləmən bu
Sevgülü yarumdən ayru.

* * *

İxtiyarım əldin alan,
Şükrülillah, gördüm səni.
Məni hicr oduna salan,
Şükrülillah, gördüm səni.

Məşğul olub xəyalına,
Müştaq idim cəmalına,
Şərəf tapıb vüsalına,
Şükrülillah, gördüm səni.

Məlahət övcünün mahi,
Könül kişvərinin şahi,
Məhəbbət püştü pənahi,
Şükrülillah, gördüm səni.

Könül yetişdi kaminə,
Dan atdı möhnət şaminə.
Rüxsətdür hicr əyyaminə,
Şükrülillah, gördüm səni.

Bitaqət olub ğayətsiz,
Müştaq idim nəhayətsiz,
Təkəllüfsüz, hekayətsiz,
Şükrülillah, gördüm səni.

Vəslin könül müddəasi,
Dəvasız dərdin dəvasi,
Mehrü məhəbbət səfasi,
Şükrülillah, gördüm səni.

Sirdaşımız olan qardaş,
Könül istədügi yoldaş,
Fəda yoluna canü baş,
Şükrülillah, gördüm səni.

Göz, könül, yüzün heyrani,
Sənsən canımın canani,

Rahəti-ruhi-Əmani,
Şükrülillah, gördüm səni.

Aləmdə ya rəb, barmola,
Mən mübtəla məhzun kimi?
Seyli-əşki rəvan olğan
Yüz sarıya Ceyhun kimi?

Aşiq olmayan dəmbədəm
Tapmaz məqasidi-əhəmm,
Cünun vadisində ələm
Gər olmasa Məcnun kimi.

Ya rəb, behəddi-e'tidal
Yaratmışmola zülcəlal,
Can çəmənində bir nihal
Ol qaməti-mövzun kimi?

Əmani, dəhri-sipənci
Dəgməz ona, çəkək rənci.
Öylə say cəm edib gənci
Qoyub getdin Qarun kimi.

* * *

Mehri-rüxsarın firqəti,
Ey rif'ət bürcünün mahi,
Biqərar olğan könlümğə
Saldı yüz min dərdü ahi.

Ğəmi-hicrandin ruzü şəb
Bar dilü canda tabü təb,
Vəslingə mən gədanı, ya rəb,
Yad etgəymi xublar şahi?

Həddin ötüpdür intizar
Bolupdur didələr xunbar,
Görməsün heç bir giriftar,
Ya rəb, bu hali-təbahi.

Aqibət sahib-raz olur,
Canan ilə dəmsaz olur,
Aləmdə sərəfraz olur
Eşq ababının agahi.

Mənligini etip fani,
Talib ol, mətlubin tani,
Çün özü başlar Əmani
Doğru yola hər gümrahi.

* * *

Ey mənüm sevgülü yarım,
Sənsən canımın canani.
Vəfadarum, ğəmgüsarım,
Sənsən, canımın canani.

Görər gözlərimin nuri,
Həzin könlümün sürури,
Neylərəm hurü qüsuri,
Sənsən, canımın canani.

Xeyli-eşqinin xəyali
Qoymadı könlümü xali,
Olmayan hərgiz timsali,
Sənsən, canımın canani.

Bilən könlümün razini,
Həqiqətü məcazini,
Suzü əczü niyazini,
Sənsən, canımın canani.

Hər xəyalum idrak edən,
Könül güzgüsün pak edən,
Vəsl ilə fərəhnak edən,
Sənsən, canımın canani.

Lütfü qəhrin əvvəl-axir
Gərək oxşar, gərək qaxir.
Həq bilür kim, batin, zahir
Sənsən canımın canani.

Ötdü gərdundin əfğanum,
Qalmadı tabü təvanum,
Çareyi-dərdi-nihanum,
Sənsən, canımın canani.

Əmaninin dilrübasi,
Əzəlidin rəhnüması,
İntihayi-müddəasi
Sənsən, canımın canani.

# Bayatılar

* * *

Bağça barın arzular,
Aşiq yarın arzular.
Hər nə kim, dünyada var
Öz miqdarın arzular.
Məhəbbət meydanidə
Mənsur darın arzular.

* * *

Cananum dək can az var,
Aramızda min raz var.
Anda ərkü naz varsa,
Məndə əczü niyaz var.
Həzər et, könül quşu,
Kəmində şahbaz var.

* * *

Yüzün göz rövşənidür,
Zülfün can cövşənidür.
Xəyalın ilən könlüm
Məhəbbət kövşənidür.

* * *

Yüzün gül xülasəsi,
Ləbin mül xülasəsi.
Ənbərəfşan kakilin
Tər sünbül xülasəsi.
Yazılmışda zatın
Cüzvü küll xülasəsi.

## LÜĞƏT

### A

*Abi-heyvan* – dirilik suyu
*Adab* – qaydalar, adətlər
*Afət* – gözəl; fəlakət
*Ariyət* – borc, əmanət
*Ariz* – üz, yanaq
*Asitan* – astana, saray qapısı
*Aşub* – qalmaqal, çaxnaşma
*Aşüftə* – pərişan, vurğun
*Aytmaq* – demək, söyləmək
*Azmayiş* – sınaq
*Azürdə* – incik, incimiş

### B

*Bab* – qapı, fəsil
*Bak* – qorxu
*Bar* – yük
*Beyti-əhzan* – qəm-qüssə evi
*Bədl* – əvəz
*Bədr* – on dörd gecəlik ay, gözəl sifət
*Bəhr* – dəniz, böyük çay
*Bəqa* – əbədilik, əbədiyyət
*Bərg* – yarpaq, vərəq
*Bərq* – ildırım, şimşək
*Bəstər* – yataq
*Bəvvab* – qapıçı, dalandar
*Bəyyinat* – aydın dəlillər, sübutlar
*Bəzl* – bağışlama
*Bəzm* – məclis, qonaqlıq
*Bixaniman* – evsiz-eşiksiz, səfil
*Bimar* – xəstə
*Buriya* – həsir
*Büka* – ağlama
*Bülhəvəs* – zövq və əyləncə ilə vaxt keçirən
*Büryan* – yanmış, yanan

## C

*Canfərsa* – ruha əziyyət verən
*Cavidan* – əbədi
*Cəşn* – şadlıq, şənlik
*Cüda* – ayrı
*Cüllab* – gülab, gül suyu

## Ç

*Çakər* – qul, kölə
*Çapük* – iti, yeyin
*Çapüksüvar* – iti gedən süvari
*Çeşm* – göz
*Çələb* – Allah

## D

*Dam* – tor, tələ, hiylə
*Damən* – ətək
*Dana* – bilici, alim
*Dey* – qış, dini əsatirə görə sayuğa nəzarət edən mələk
*Dəğəl* – saxta
*Dəhr* – dövr, zaman, dünya
*Dəmsaz* – uyuşan, yoldaş
*Dəndan* – diş
*Dəriğa* – əfsus, heyf
*Dəyyar* – yaşayan, sakin, rahib
*Didar* – görüş, üz
*Dideyi-giryan* – ağlayan göz
*Diləfgar* – ürəyi sınmış, dərin kədəri olan
*Dilsitan* – könül alan, sevgili
*Dun* – alçaq, aşağı
*Duzəx* – cəhənnəm
*Dünbalə* – son, arxa, geri
*Dürri-qəltan* – yuvarlaq inci, qiymətli inci
*Dürri-şahvar* – şaha layiq inci
*Düruğ* – yalan
*Düşvar* – çətin

## E

*Ehtiraq* – yanma, odlanma
*Ehya* – diriltmə, həyat vermə
*E'tidal* – orta halda olma, mülayimlik
*Eydi-əzha* – qurban bayramı
*Eymən* – qorxusuz, salamat

## Ə

*Əbri-göhərbar* – inci saçan bulud
*Əbri-neysan* – yağmurlu bulud
*Əbru* – qaş
*Əbtər* – sonsuz, övladsız, faydasız
*Əbvab* – qapılar
*Əcnas* – cinslər
*Əcuz* – qoca qarı, fani dünya
*Ədəm* – yoxluq, olmama
*Ədəs* – mərciмək danəsi, linza
*Ədyan* – dinlər
*Əf'al* – işlər
*Əfsar* – cilov
*Əfsər* – tac, bəzəkli, qaş-daşlı
*Əhbab* – dostlar, istəkli
*Əhzan* – qəmlər
*Əxzər* – yaşıl
*Əxi* – qardaş
*Əxtər* – ulduz
*Əkl* – yemə, yeməli
*Əkrəm* – kəramətli, comərd
*Əqd* – nikah, bağlama, qurma
*Əqdi-üxüvvət* – qardaşlıq sazişi
*Əqran* – tay-tuşlar, ərlər
*Əqsam* – hissələr
*Əqval* – sözlər, danışıqlar
*Əlaiq* – əlaqələr
*Əlhan* – gözəl səslər, gözəl mahnılar
*Əlqab* – ləqəblər
*Əlminnətüllah* – Allaha şükür, Allahın köməyilə
*Əltaf* – lütflər

*Ə'ma* – kor
*Ə'mal* – işlər, əməllər
*Ənba* – mə'lumatlar
*Ənbiya* – peyğəmbərlər, nəbilər
*Əncüm* – ulduzlar
*Əncümən* – məclis, toplanış
*Əndəlib* – bülbül
*Əndişə* – fikir, düşüncə
*Ənduh* – qəm, qüssə
*Ənfas* – nəfəslər
*Ənkəbut* – hörümçək
*Ənqa* – Qaf dağında yaşayan əfsanəvi quş, Simürğ
*Ənqərib* – tezliklə, yaxın zamanda
*Ənvar* – işıqlar, aydınlıq
*Ənzar* – nəzərlər, baxışlar
*Ə'rab* – çöldə yaşayan ərəblər
*Ər'ər* – ardıc ağacı, dağ sərvi
*Əsəl* – bal
*Əsləhə* – silahlar, yaraq
*Əşcar* – ağaclar
*Əşhər* – çox şöhrətli, məşhur
*Əyyar* – hiyləgər, dolandırıcı, çoxbilmiş

**F**

*Faiq* – üstün, qalib
*Fail* – işləyən, yaradan
*Fasid* – pozulmuş, pozuq
*Fərrux* – uğurlu, mübarək
*Fərsudə* – solğun, solmuş
*Fərzanə* – alim, bilici
*Fəttan* – araqarışdıran, məftun edən gözəl
*Füzun* – artıq

**G**

*Gərdun* – dolanan, dönən, fələk
*Gərm* – isti
*Gəzaf* – şişirtmə, əsassız

*Göftar* – danışıq, söz
*Guş* – qulaq
*Gülgun* – gül rəngli
*Güşad* – geniş, açıqlıq
*Güzin* – seçən, bəzənilmiş

**H**

*Hadi* – doğru yol göstərən
*Haziq* – məharətli, bacarıqlı
*Həbbaza* – nə gözəl, afərin
*Həbib* – dost
*Hərim* – məhrəm yer
*Həzar* – min
*Hübb* – sevgi

**X**

*Xab* – yuxu
*Xaksar* – toz-torpağa bulanmış
*Xar* – tikan, gözdən düşmüş
*Xəvvas* – xasiyyətlər, seçilmişlər
*Xədəng* – ox
*Xəffaş* – yarasa, gecəquşu
*Xirə* – bulanıq, qarışıq
*Xirəd* – ağıl
*Xirqə* – dərvişlərin geydiyi üst geyim
*Xişt* – kərpic
*Xizab* – tünd qırmızı boyaq
*Xöcəstə* – uğurlu, xoşbəxt
*Xu* – xasiyyət
*Xüd* – öz, özü

**İ**

*İbham* – şübhə, güman
*İbram* – tə'kid etmə, israr
*İbtal* – aradan qaldırma, ləğv etmə

*İctinab* – çəkinmə, sağınma
*İdbar* – bəxtsizlik, talesizlik
*İfham* – anlama, başa düşmə
*İxtilat* – görüşmə, qaynayıb qarışma
*İxfa* – örtülü, gizli
*İkram* – hörmət, təzim
*İqtida* – yamsılama
*İltica* – sığınma, pənah
*İlzam* – məcbur etmə, vadar etmə
*İməs* – olmaz
*İmsak* – nəfsini saxlama, qənaət, xəsislik
*İnfial* – utanma, həyəcana gəlmə
*İnqita* – kəsilmə, tamam olma
*İntifa* – fayda, istifadə
*İnziva* – bir guşəyə çəkilmə, dünyadan əl çəkmə
*İrişmək* – çatmaq, yetişmək
*İrtifa* – yüksəlmə, yüksəklik
*İstehraq* – haqlı olma, zəhmət haqqı
*İstid'a* – yalvarıb istəmə, xahiş etmə
*İstiğna* – qane olma, etina etmə
*İstiğraq* – batma, ifrat dərəcəsinə varma
*İstima* – dinləmə, qulaq asma
*İştihar* – ad qazanma
*İtab* – üzünü danlama
*İttisal* – bitişmə, yaxınlıq
*İzhar* – aşkar etmə, ifadə etmə
*İzəd* – Tanrı

**K**

*Kafil* – bir işi boynuna çəkmə, zamin
*Kamran* – kam alan, xoşbəxt
*Kar* – iş
*Key* – haçan, havaxt
*Kəffaf* – dolanacaq, yaşamaq üçün vəsait
*Kəffarət* – bağışlanma, günahını yuma
*Kəfş* – başmaq, ayaqqabı
*Kəhalət* – göz həkimliyi
*Kəhhal* – sürməçi qadın

*Kəvakib* – ulduzlar
*Kibr* – böyüklük, lovğalanma
*Kilk* – qələm
*Kişvər* – ölkə
*Kizb* – yalan
*Köhl* – sürmə
*Köp* – çox
*Kuy* – küçə, keçiləcək yer
*Küfr* – kafirlik, dinsizlik
*Külbə* – daxma, sığınacaq yer

**Q**

*Qafilə* – karvan
*Qaliyə* – müşk və ənbərin qarışığı qara yağ, qara
*Qasir* – qısa, gücsüz, naqis
*Qeysər* – hökmdar, padşah
*Qəllaş* – hiyləgər, kefcil
*Qəltan* – yumru, diyirlənən
*Qərinə* – oxşar, zaman
*Qəvi* – güclü, sağlam
*Qəvvas* – dalğıc, üzgüçü
*Qut* – qida, yeyilən şey
*Quyaş* – günəş
*Qüllab* – qarmaq
*Qürb* – yaxınlıq, qonşuluq
*Qürs* – dairəvi şey, yastı və girdə həb

**L**

*Laf* – söz, boş danışıq
*Lamisə* – toxunma duyğusu
*Latail* – faydasız, boş
*Layə'qəl* – ağılsız, dəli
*Layəmut* – ölməz, əbədi
*Leyl* – gecə
*Ləbbeyk* – bəli, hazıram
*Ləəb* – oyun

*Ləhv* – oyun, əyləncə
*Lə'l* – qırmızı rəngli qiymətli daş
*Ləm'ə* – parıltı
*Ləntərani* – "məni görə bilməzsən" (Quranda bir ayə)
*Lö'löyi-şəhvar* – şaha layiq inci

**M**

*Mafiha* – malik olduğun şey
*Mah* – ay
*Mahmənzər* – ağüzlü, gözəl
*Mehman* – qonaq
*Mədəd* – kömək, yardım
*Məhcub* – örtülü, utanan
*Məhcur* – ayrı düşmüş, unudulmuş
*Məhtab* – aydınlıq gecə
*Məhvəş* – ay kimi
*Məqal* – söz, söyləmə
*Məqdur* – imkan qədər, tale
*Məlamət* – qınama, qaxınc
*Məlbus* – geyilmiş, işlənmiş
*Məllah* – dənizçi, gəmiçi
*Mənsubə* – vəzifə, tikilmiş
*Mənsux* – qüvvədən düşmüş
*Mərəz* – xəstəlik
*Mərğub* – istənilən, sevilən
*Məsaf* – vuruş, döyüş meydanı
*Məsih* – sürtülmüş, yağlanmış; İsa peyğəmbərin ləqəbi
*Məsrur* – sevinc, şad
*Məşam* – burun
*Məşhun* – dolu, yüklü
*Məşkur* – təşəkkürə layiq
*Məşrəb* – içilən yer; xasiyyət
*Mətlub* – istənilən
*Mə'va* – yurd, məskən
*Miad* – qayıtma
*Mirab* – suvarma işinə baxan
*Mir'at* – güzgü

*Möquf* – ayrılmış, dayandırılmış,
*Mö'tad* – vərdiş edilmiş, mülayim
*Mur* – qarışqa
*Muşikaf* – incədən-incəyə düşünən, hər şeyə fikir verən
*Muy* – tük
*Müamilə* – rəftar, alver
*Mübtəla* – vurulmuş, tutulmuş
*Müfid* – faydalı
*Müğəddəl* – dəyişdirilmiş
*Müğtənəm* – faydalı, xeyirli
*Müin* – köməkçi
*Mükəddər* – kədərli, qəmli
*Müqarin* – bitişən, birləşən
*Müqəyyəd* – asılı olan, bağlanmış
*Müqtəda* – təqlid edilən adam, başçı
*Mümtaz* – seçmə, ən yaxşı
*Müncərr* – bir nəticəyə gəlib çatan
*Mündəris* – çürümüş, izi-tozu qalmayan
*Münqöte* – kəsilmiş, parçalanmış
*Münfəil* – peşman
*Mün'im* – bağışlayan; varlı
*Mürğ* – quş
*Müsəxxər* – tutulmuş, itaətə gətirilmiş
*Müsəlləm* – verilmə, aid edilmə
*Müstəğrəq* – batmış, dalmış
*Müstəme* – dinləyən, qulaq asan
*Müşərrəf* – şərəflənmiş
*Müşfiq* – sevən, mehriban
*Müttəle* – xəbərdar
*Müttəsil* – dalbadal, arasıkəsilmədən
*Müztərr* – məcbur, sıxıntılı

**N**

*Nabud* – yox olma, tapılmaz
*Nafərcam* – pis nəticəli
*Nalan* – ağlayan
*Nam* – ad
*Nar* – od

*Naseh* – öyüd verən
*Natəvan* – zəif, gücsüz
*Nerdə* – harada
*Nədamət* – peşmançılıq
*Nəhib* – ah-nalə ilə ağlama
*Nəhif* – arıq, zəif
*Nəkhəş* – iy, çoxu
*Nəng* – ar, namus
*Nərrad* – nərd oynayan
*Nəyh* – qadağan
*Nigin* – üzük qaşı
*Nigun* – başaşağı, tərsinə dönmüş
*Nihan* – gizli
*Nik* – yaxşı, gözəl
*Nisar* – səpmə, dağıtma
*Nizar* – gücsüz, zəif
*Nübüvvət* – peyğəmbərlik

**Ö**

*Övc* – göyün ən yüksək qatı
*Övğat* – vaxtlar, əhval
*Övliya* – müqəddəs şəxsiyyətlər

**P**

*Payə* – dərəcə, mənsəb
*Peyğam* – sifariş, söz
*Peykan* – oxun ucu, kirpik
*Peyvəstə* – daim, ardıcıl
*Pənd* – öyüd, nəsihət
*Pərran* – uçan, keçən
*Pərtov* – parlaq, işıq
*Pərva* – qorxu, çəkinmə
*Piç* – buruq, qıvrım
*Pişə* – peşə, sənət
*Pürnur* – çox işıqlı, parlaq

## R

*Raz* – sirr
*Razi-pünhan* – gizli sirr
*Reyb* – şübhə
*Rəg* – damar
*Rəğmən* – qarşı, əks istiqamətdə
*Rəhlət* – köçmə, səfər etmə
*Rəhnüma* – yol göstərən
*Rəhrov* – yolçu, yol gedən
*Rəqm* – əksinə hərəkət
*Rəm* – hürkmə
*Rəməq* – son nəfəs, az miqdar
*Rəst* – qurtulma
*Rətbü lisan* – hər nə var, cəfəngiyat
*Rəviş* – qayda, gediş
*Rəzzaq* – qida verən, Allah
*Rida* – dərvişlərin yun qumaşı
*Rizq* – yeyəcək, yeyinti

## S

*Sail* – dilənçi; soran, soruşan
*Salik* – düz yolla gedən, mürid
*Sal* – il
*Sayru* - xəstə
*Seyli-əşk* – göz yaşı seli
*Səba* – səhər yeli, nəsim
*Sə'b* – sərt, çətin
*Səbti-ə'mal* – qeyd olunan işlər
*Səbuh* – sübh çağı içilən şərab
*Səbzəzar* – çəmənlik, yaşıllıq
*Səhba* – şərab, badə
*Səhl* – yüngül, asan
*Səxa* – əliaçıq, səxavətli
*Səncidə* – vəznli, çəkilmiş, yerində deyilən
*Sərbaz* – əsgər
*Sərəfraz* – başı uca, başqalarından seçilən
*Sərgərdan* – avara, sərsəri
*Sərzəniş* – danlaq, qaxınc

*Səzavar* – layiq, uyğun, yaraşan
*Sipəhr* – göy, asiman, tale
*Sirişk* – göz yaşı
*Süda* – başağrısı
*Süluk* – silklər, bir ictimai təbəqə
*Sün'* – yaradılış, iş görmə, əməl

**Ş**

*Şab* – cavan, igid
*Şanə* – daraq
*Şeyb* – qocalıq
*Şəbab* – cavanlıq
*Şəqq* – yarma, parçalama
*Şəmim* – gözəl qoxulu
*Şərarə* – qığılcım
*Şu* – bu
*Şum* – uğursuz

**T**

*Tan* – qəm, əcəb, təəccüblü
*Tar* – qaranlıq
*Təbah* – puç olmuş, məhv olma
*Təbdil* – dəyişdirmə
*Təəllüq* – asılı olma, asılma
*Təəşşüq* – aşiq olma, sevmə
*Təqərrüb* – yaxın olma
*Təqrib* – yaxınlaşdırma
*Təqrir* – yerləşdirmə, söyləyib anlatma
*Təməllüq* – aydınlaşdırma
*Tərəb* – şadlıq, sevinc
*Təriq* – yol, cığır
*Təvəssül* – yaxın olma, yaxınlıq
*Təvəttün* – vətən salma, yurd salma
*Təvəccöh* – üz çevirmə, meyl, rəğbət
*Tilbə* – xəstə, qəmli
*Tügün* – düyün
*Türfə* – əcayib, qəribə

## U

*Ulaşmaq* – çatmaq, yetişmək
*Us* – ağıl
*Uş* – budur, artıq
*Uyqu* – yuxu

## V

*Vabəstə* – bağlı, asılı, kömək
*Vaiz* – moizə edən
*Vajgun* – devrilmiş, üzüqoylu
*Varəstə* – qurtulmuş
*Vərziş* – işləmə, çalışma, idman
*Vird* – dua, daima təkrar edib söyləmə
*Vühuş* – vəhşilər, yırtıcılar

## Y

*Yekzəban* – sözübir, dilbir
*Yəd* – əl, kömək
*Yəzdan* – Tanrı
*Yövmül-qür'ə* – püşk günü
*Yüküş* – çox

## Z

*Zair* – ziyarətə gedən
*Zayir* – ziyarət edən
*Zəbun* – qüvvətsiz, zəif, əsir
*Zəxm* – yara, yaralama
*Zənəxdan* – çənə
*Zib* – bəzək, zinət
*Zindəgani* – dirilik, yaşayış
*Zinhar* – saqın, aman
*Zişt* – çirkin, yaraşıqsız
*Zünnar* – xristian ruhanilərinin bağladığı qurşaq

## MÜNDƏRİCAT

| | |
|---|---|
| Buraxılışa məsul: | *Əziz Güləliyev* |
| Texniki redaktor: | *Rövşən Ağayev* |
| Tərtibatçı-rəssam: | *Nərgiz Əliyeva* |
| Kompyuter səhifələyicisi: | *Rəvan Mürsəlov* |
| Korrektor: | *Pərvanə Məmmədova* |

Yığılmağa verilmişdir 02.08.2004. Çapa imzalanmışdır 05.01.2005.
Formatı 60x90 $^{1}/_{16}$. Fiziki çap vərəqi 14. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 2.

Kitab "Şərq-Qərb" mətbəəsində çap olunmuşdur.
Bakı, Aşıq Ələsgər küç., 17.